QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

Oktyabr 2015
07 (1071)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Şəki şəhərində Bəxtiyar Vahabzadənin ev-muzeyinin yaradılması və yaşadığı binaya xatirə lövhəsinin vurulması haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Azərbaycan ədəbiyyatının görkəmli simalarından biri, xalq şairi, tanınmış ictimai xadim, SSRİ və Azərbaycan Respublikasının Dövlət mükafatları laureatı, akademik Bəxtiyar Vahabzadənin azərbaycançılıq məfkurəsinə sədaqət və tarixi-mədəni dəyərlərə ehtiram aşılayan, istiqlal ideyaları ilə zəngin yaradıcılığı milli ədəbi fikir xəzinəsinə qiymətli töhfə təşkil edir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və xalq şairi Bəxtiyar Vahabzadənin Azərbaycan mədəniyyətinin inkişafında böyük xidmətlərini nəzərə alaraq qərara alıram:

Azərbaycan Respublikasının Nazirlər Kabineti:

1. Şəki şəhərində xalq şairi Bəxtiyar Vahabzadənin ev-muzeyinin yaradılması və onun Şəkidə yaşadığı binaya xatirə lövhəsinin vurulması ilə bağlı zəruri tədbirlərin həyata keçirilməsini təmin etsin;

2. bu sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 27 oktyabr 2015-ci il*

# Elmi Şuranın iclası keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universiteinin (ADPU) Elmi Şurasının oktyabr ayının 9-da keçirilən iclasının gündəliyində aşağıdakı məsələlər dayanırdı: 2015-2016-cı tədris ili üçün bakalavriat və magistratura pilləsinə qəbulun nəticələri haqqında




məlumat; universitetdə struktur dəyişiklikləri haqqında; tədrisin keyfiyyətini yüksəltmək məqsədilə professor-müəllim heyətinin əməyinin stimullaşdırılması tədbirləri haqqında; universitetin Elmi Şurasının iş planının müzakirəsi; cari məsələlər; kafedralar üzrə dosent vəzifələrinə seçkilər.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Elmi Şuranın sədri, professor Yusif Məmmədov iclası giriş sözü ilə açaraq 2015-2016-cı tədris ili üçün bakalavriat və magistratura pilləsinə qəbulun nəticələri haqqında məlumat vermək üçün sözü universitetin qəbul komissiyasının məsul katibinin müavini, professor İbrahim Bayramova verib. Professor İ.Bayramov bildirib ki, builki tədris ilində ADPU-ya ali təhsilin bakalavriat pilləsinə 21 ixtisas üzrə 2073 nəfər bakalavr qəbul edilib. Onlardan 1334 nəfəri dövlət sifarişi əsasında, 739 nəfəri isə ödənişli əsaslarla qəbul edilib. Qeyd edək ki, bu il ADPU-ya dövlət sifarişi əsasında qəbul 64,4%-i təşkil edib. Ali təhsilin magistratura pilləsinə isə 20 ixtisas üzrə 295 nəfər magistrant qəbul edilib. Onlardan 137-si dövlət sifarişi əsasında, 158-i isə ödənişli əsaslarla qəbul olub. Onu da qeyd edək ki, 2014-2015-ci tədris ilində ADPU-ya qəbul olan tələbələrdən 19 nəfəri 500 və 500-dən çox bal toplamışdı. Cari tədris ilində isə ADPU-ya qəbul olan tələbələrdən 188 nəfəri 500 və 500-dən çox bal toplayıb ki, bu da ötən illə müqayisədə təxminən 10 dəfə çoxdur. Bu il həm də ADPU-da ilk dəfə bəzi ixtisaslar üzrə rus bölməsi açılıb. Bütövlükdə 2015-2016-cı tədris ilində ADPU-ya qəbul planı yerinə yetirilib.

ADPU-nun rektoru, professor Yusif Məmmədov iclasın bu məqamında Təhsil Nazirliyinin son illər müəllim hazırlığına xüsusi diqqət yetirdiyini və ölkəmizdə müəllim peşəsinə marağın artdığını vurğulayıb. Rektor Y.Məmmədov qeyd edib ki, son illər orta məktəblərdə həyata keçirilən müxtəlif layihələr, stimullaşdırıcı tədbirlər və s. bu məqsədə xidmət edir. Bu yaxınlarda Təhsil Nazirliyinin dəstəyi ilə ADPU-nun Fizika, Kimya və Biologiya fakültələrində Almaniya istehsalı olan yüksək səviyyəli müasir avadanlığın quraşdırılması da Təhsil Nazirliyinin müəllim hazırlığına olan diqqət və qayğısının əyani təzahürüdür. 2014-2015-ci tədris ilindən başlayaraq Təhsil Nazirliyi tərəfindən "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Bu təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbələrə şamil olunur. Təhsil Nazirliyi həmin tələbələrə 100 manat xüsusi təqaüd verir. Ötən tədris ilində 300 tələbə bu təqaüdü alıb. Bu il də 300 nəfər I kurs tələbəsinə "Gələcəyin müəllimi təqaüdü"nün verilməsi nəzərdə tutulur. Beləliklə, bu təqaüdü alanların sayı 600 nəfər olub. Bu da öz növbəsində gənclərin ixtisas seçimi zamanı müəllim peşəsini seçmələrinə müsbət təsir göstərir. Biz də öz növbəmizdə gənclərin ali təhsil almaları üçün ADPU-ya cəlb olunmaları istiqamətində fəaliyyətimizi gücləndirməli, tədrisin və təhsilin keyfiyyətini yüksəltməli, universitetdə daxili nizam-intizam qaydalarını, əmək intizamını və dərsə davamiyyət məsələlərini daim diqqət mərkəzində saxlamalı, bir sözlə, ali pedaqoji təhsilin öncülü olduğumuzu əməli fəaliyyətimizlə sübut etməliyik.

ADPU-da struktur dəyişiklikləri haqqında da universitetin rektoru, professor Y.Məmmədov çıxış edib. Rektor Y.Məmmədov məlumat verərək bildirib ki, hazırda ADPU-da 45 kafedra fəaliyyət göstərir. Universitetdə idarəetmənin təkmilləşdirilməsi və kafedraların fəaliyyətinin səmərəliliyinin artırılması üçün bəzi kafedraların birləşdirilməsi zərurəti yaranıb. Filologiya fakültəsinin Azərbaycan dilçiliyi kafedrası, Müasir Azərbaycan dili kafedrası, Azərbaycan ədəbiyyatı tarixi kafedrası, Dünya ədəbiyyatı kafedrası, həmçinin Coğrafiya və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin Fiziki coğrafiya və Ümumi coğrafiya kafedraları belə kafedralardandır. Buna görə də Azərbaycan dilçiliyi və Müasir Azərbaycan dili kafedralarının, Azərbaycan ədəbiyyatı tarixi və Dünya ədəbiyyatı kafedralarının, eləcə də Fiziki coğrafiya və Ümumi coğrafiya kafedralarının birləşdirilməsi və yeni kafedraların yaradılması məqsədəuyğundur.

Səmərəli keçən müzakirə zamanı Elmi Şura üzvləri Azərbaycan dilçiliyi və Müasir Azərbaycan dili kafedralarının, Azərbaycan ədəbiyyatı tarixi və Dünya ədəbiyyatı kafedralarının, həmçinin Fiziki coğrafiya və Ümumi coğrafiya kafedralarının birləşdirilməsi və yeni kafedraların yaradılmasına səs veriblər. Mövcud qanunvericiliklə nəzərdə tutulmuş müddətdə həmin kafedraların müdiri vəzifələrinə seçkilər keçiriləcəkdir. Qeyd edək ki, gələcəkdə digər fakültələrdə də dərs yükü az olan və eyniyönümlü kafedraların birləşdirilməsi nəzərdə tutulur.

Eyni zamanda Elmi Şuranın iclasında Fizika fakültəsinin, Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin ləğv olunması, Pedaqoji fakültənin İbtidai təhsil fakültəsi, həmçinin Pedaqogika və psixologiya fakültəsinin Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsi adlandırılması barədə qərar qəbul edilib. Elmi Şuranın iclasında Fizika və ümumi texniki fənlər fakültəsinin, həmçinin Musiqi və təsviri incəsənət fakültəsinin yaradılması barədə də qərar verilib. Fizika və ümumi texniki fənlər fakültəsinin tərkibində aşağıdakı kafedralar fəaliyyət göstərəcək: Fizikanın tədrisi metodikası kafedrası; Elektrik və optika kafedrası; Mexanika və molekulyar fizika kafedrası; İstehsalatın əsasları kafedrası.

**(Davamı 2-ci səhifədə)**



(Əvvəli 1-ci səhifədə)

# Elmi Şuranın iclası keçirilib

Musiqi və təsviri incəsənət fakültəsinin tərkibində isə aşağıdakı kafedralar fəaliyyət göstərəcək: Musiqi və onun tədrisi metodikası kafedrası; Musiqi alətləri fənlərinin tədrisi metodikası kafedrası; Rəsm, heykəltaraşlıq və boyakarlıq kafedrası; Təsviri incəsənət, rəsmxətt və onların tədrisi metodikası kafedrası. Yeni yaradılan Defektologiya kafedrası isə Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin tərkibində fəaliyyət göstərəcəkdir. Qeyd olunanlarla yanaşı, Elmi Şuranın iclasında Rus dili kafedrasında alman, fransız və fars dillərinin tədris olunması haqqında da qərar qəbul edilib.

Elmi Şuranın iclasında tədrisin keyfiyyətini yüksəltmək məqsədilə professor-müəllim heyətinin əməyinin stimullaşdırılması tədbirləri haqqında da universitetin rektoru, professor Y.Məmmədov çıxış edib. Rektor Y.Məmmədov qeyd edib ki, yaxın gələcəkdə professor-müəllim heyəti üçün diferensiallaşdırılmış əməkhaqqı sistemi tətbiq ediləcək. Bu sistemin tətbiq edilməsində əsas məqsəd universitetdə tədrisin keyfiyyətini yüksəltmək və professor-müəllim heyətinin fəaliyyətini stimullaşdırmaqdır. Bunun üçün xüsusi meyarların işlənib hazırlanması nəzərdə tutulur.

İclasda Elmi Şuranın 2015-2016-cı tədris ili üçün iş planı müzakirə olunaraq qəbul edilib, cari məsələlər müzakirə olunub, həmçinin kafedralar üzrə dosent vəzifələrinə seçkilər keçirilib.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**

# Rektor Yusif Məmmədov I kurs tələbələri ilə görüş keçirib



Oktyabr ayının 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov İbtidai təhsil fakültəsinin və Coğrafiya və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin professor-müəllim heyəti və I kurs tələbələri ilə görüş keçirib. Səmimi və canlı ünsiyyət şəraitində keçən görüş zamanı ADPU-nun rektoru, professor Yusif Məmmədov ilk olaraq tələbə-gəncləri bir daha universitetə qəbul olmaları münasibətilə təbrik edib, onlara möhkəm cansağlığı, uzun ömür, həyatda və təhsildə uğurlar arzulayıb.

Rektor Y.Məmmədov tələbələrlə söhbəti zamanı onlara ADPU-nun yaranma tarixi, keçdiyi böyük inkişaf yolu və bugünkü fəaliyyəti, tədris prosesi, beynəlxalq əlaqələri barədə ətraflı məlumat verib, müəllim peşəsinin yüksəkliyindən,



müqəddəsliyindən danışıb. Rektor qeyd edib ki, ADPU fəaliyyət göstərdiyi müddət ərzində elm və təhsilimizin inkişafına sanballı töhfələr verib.

Rektor Y.Məmmədov öz çıxışında xalqımızın böyük oğlu, müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, ümummilli liderimiz Heydər Əliyevin həmişə müəllim adına, müəllim əməyinə yüksək qiymət verdiyini bildirmişdir. Ulu öndər Heydər Əliyev demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram". Dahi öndər Heydər Əliyevin müdrik siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev təhsili respublikamızın davamlı inkişaf strategiyasının əsas istiqamətlərindən biri elan etmiş, ölkəmizin zəngin iqtisadi potensialının intellekt kapitalına çevrilməsini vacib bir vəzifə kimi qarşıya qoymuşdur. Eyni zamanda dövlət başçımız İlham Əliyev son illər cəmiyyətdə müəllim peşəsinin ictimai nüfuzunun yüksəldilməsi, müəllimlərin maddi-sosial vəziyyətinin yaxşılaşdırılması, həmçinin pedaqoji fəaliyyətin stimullaşdırılması və bu sahədə sağlam rəqabət mühitinin yaranması üçün dövlət səviyyəsində əməlli tədbirlər həyata keçirir. Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti,millət vəkili, YAP-ın Sədr müavini, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyeva təhsil sahəsinə xüsusi qayğı və diqqət göstərərək bu sahənin yüksək səviyyədə inkişaf etməsi üçün müxtəlif layihələri uğurla həyata keçirir.

Rektor Y.Məmmədov qeyd edib ki, Təhsil Nazirliyi tərəfindən ötən tədris ilində "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Bu təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimi zamanı birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbələrə şamil olunur. Ötən tədris ilində 300 nəfər tələbə bu təqaüdü alıb. Bu il isə ikinci dəfə 300 nəfər I kurs tələbəsinə "Gələcəyin müəllimi təqaüdü" verilib. Bununla da, bu təqaüdü alanların sayı 600 nəfər olub.

Rektor Y.Məmmədov çıxışına davam etdirərək bildirib ki, ötən tədris ilində ADPU-ya qəbul olan tələbələrdən 19 nəfəri 500 və 500-dən çox bal toplamışdı. Builki tədris ilində isə ADPU-ya qəbul olan tələbələrdən 188 nəfəri 500 və 500-dən çox bal toplayıb ki, bu da ötən illə müqayisədə təxminən 10 dəfə çoxdur. Bu, bizi sevindirir. Lakin biz bu göstərici ilə kifayətlənməməli, gənclərin ali təhsil almaq üçün ADPU-ya axınını gücləndirmək istiqamətində daha çox çalışmalıyıq.

Rektor Y.Məmmədov tələbə-gənclərə ali təhsil illərində yaxşı oxumağı, xarici dilləri, müasir informasiya-kommunikasiya texnologiyalarını dərindən öyrənməyi, bir sözlə, yüksəkixtisaslı mütəxəssis kimi yetişməyi tövsiyə edib.

Görüşdə ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov,Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, Ümumi işlər üzrə prorektoru Əbdül Xalıqov iştirak ediblər. Görüşdə tələbə-gənclərin müxtəlif sualları cavablandırılıb.

**Mətbuat və informasiya şöbəsi**

# "Media və təhsil dialoqu: peşəkarlığın inkişafı" mövzusunda növbəti təlim konfransı keçirilib

***Oktyabrın 30-da Təhsil Nazirliyinin təşəbbüsü ilə Azərbaycan Dövlət Neft və Sənaye Universitetində "Media və təhsil dialoqu: peşəkarlığın inkişafı" mövzusunda növbəti təlim konfransı keçirilib.***

Təhsil Nazirliyinin və Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin (ADNSU) birgə təşkilatçılığı ilə keçirilən təlim konfransında Təhsil Nazirliyinin əməkdaşları, media qurumlarının və ali təhsil müəssisələrinin mətbuat xidmətlərinin rəhbərləri, təhsillə bağlı qeyri-hökumət təşkilatlarının nümayəndələri və təhsil ekspertləri iştirak ediblər.

"Media və təhsil dialoqu: peşəkarlığın inkişafı" mövzusunda növbəti təlim konfransının rəhbərlik etdiyi ali məktəbdə keçirilmə-



sindən məmnunluğunu ifadə edən ADNSU-nun rektoru, professor Mustafa Babanlı tədbir iştirakçılarını salamlayıb və ölkəmizdə həyata keçirilən genişmiqyaslı təhsil islahatlarının ictimaiyyətə dolğun şəkildə çatdırılmasında medianın rolunun əhəmiyyətini vurğulayıb.

"Təhsil" TV və "APA-Holdinq"in informasiya dəstəyi ilə təşkil olunmuş konfransda media və təhsil dialoqunun daha da yaxşılaşdırılması, səmərəli qarşılıqlı əməkdaşlıq baxımından peşəkarlığın inkişafı ilə bağlı müzakirələr aparılıb, müvafiq təklif və tövsiyələr səslənidirilib. Çıxışlarda təhsil qurumları ilə media arasında əlaqələrin



daha da inkişafı, yeni əməkdaşlıq mühitinin yaradılması və bu işin davamlı, sistemli aparılmasının əhəmiyyəti vurğulanıb.

Təlim konfransında Bakı Dövlət Universitetinin (BDU) Televiziya və radio jurnalistikası kafedrasının müdiri Aynur Kərimovanın "Daxili kommunikasiya və sosial şəbəkələr", BDU-nun doktorantı Turac Əliyevanın "Daxili PR - təşkilat daxili yazışmaların aparılması", "ADA" Universitetinin rektorluq aparatının rəhbəri, mətbuat xidmətinin rəhbəri əvəzi Şəfəq Mehrəliyevanın "Ali təhsil müəssisələrində ictimaiyyətlə əlaqələr işi: problemlər və yeni çağırışlar" və Təhsil Nazirliyinin QHT və KİV-lə iş sektorunun müdiri Cəsarət Valehovun "Ali təhsil müəssisələrinin mətbuat xidmətlərinin fəaliyyətinin monitorinqi" mövzularında təqdimatları dinlənilib və təlimlər keçirilib.

Sonra təhsil eksperti Şahlar Əsgərov, "525-ci qəzet"in baş redaktoru, Azərbaycan Yazıçılar Birliyinin katibi, Mətbuat Şurası İdarə Heyətinin üzvü Rəşad Məcid, "İki sahil" qəzetinin baş redaktoru Vüqar Rəhimzadə və başqaları çıxış edərək təhsil-media əlaqələri sahəsində belə konfransların keçirilməsinin mühüm əhəmiyyətini qeyd ediblər. Konfrans iştirakçıları həm də konfrans çərçivəsində ADNSU-nun tarix muzeyi və laboratoriyası ilə tanış olublar.

Qeyd edək ki, bu təlim konfransı Təhsil Nazirliyinin "Media və təhsil dialoqu" çərçivəsində keçirdiyi sayca IV konfransdır.

Elm xadimləri

# Böyük şərqşünas alim, bacarıqlı elm təşkilatçısı



***XX əsrdə Azərbaycanın dünya elminə bəxş etdiyi görkəmli simalardan biri şərqşünas alim, pedaqoq, filologiya elmləri doktoru, professor Aida xanım İmanquliyevadır. Alim Şərq filologiyasının müxtəlif aspektləri üzrə apardığı tədqiqatlarla, yaratdığı fundamental əsərlərlə elm tariximizə sanballı möhür vurmuş, müasir ərəb ədəbiyyatının tədqiqində yeni səhifə, uğurlu yol açmışdır. Aida xanım dərin nəzəri bilikləri, analitik təfəkkürü, geniş erudisiyası, bir neçə Şərq və Qərb dillərini bilməsi sayəsində apardığı araşdırma və yazdığı əsərlər qısa müddət ərzində ona nəinki keçmiş Sovet İttifaqında, hətta bir çox xarici ölkələrdə də geniş şöhrət gətirmişdir.***

Professor Aida İmanquliyeva çoxsaylı elmi əsərlərinə əbədi ömür bəxş etmiş, bütün varlığı milli kökə, xalqa bağlı şəxsiyyət olmuşdur. Onun əsərlərində xalqın maariflənməsi, milli yaddaşın qorunması, tərəqqiyə doğru irəliləməsi kimi nəcib niyyətlər daim özünü qabarıq göstərmişdir. Elmi tədqiqatlarını əsl alim təəssübkeşliyi ilə aparan, ərəb filologiyası sahəsində özünəməxsus məktəb yaradan görkəmli alim ərəb ədəbiyyatının bir sıra korifeylərinin yaradıcılığını tamamilə yeni rakursdan araşdıraraq onları Azərbaycan ədəbi ictimaiyyətinə tanıtmışdır. Bununla da Aida xanım ərəb və Azərbaycan ədəbiyyatları arasında möhkəm körpü yaratmağa, ədəbi xəzinəmizi daha da zənginləşdirməyə çalışmışdır.

Aida İmanquliyeva 1939-cu il oktyabrın 10-da Bakı şəhərində ziyalı ailəsində anadan olmuşdur. 1957-ci ildə Bakıdakı 132 saylı orta məktəbi qızıl medalla bitirmişdir. 1957-ci ildə Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin ərəb filologiyası bölməsinə daxil olmuşdur. 1962-ci ildə ali təhsilini bitirəndən sonra həmin universitetin Yaxın Şərq xalqları ədəbiyyatı kafedrasının aspirantı olmuş, daha sonra keçmiş SSRİ Elmlər Akademiyasının Asiya Xalqları İnstitutunun aspiranturasında təhsilini davam etdirmişdir. 1966-cı ildə dünya şöhrətli elmi rəhbərlərinin - Rüstəm Əliyevin və İosif Braginskinin xeyir-duası ilə namizədlik dissertasiyası müdafiə edib alimlik dərəcəsini almışdır. Sonra Azərbaycan EA-nın Şərqşünaslıq İnstitutunda işə başlamışdır.

Aida xanım elmin bütün enişli-yoxuşlu yollarını pillə-pillə keçmiş, zəhməti, istedadı, zəkası, qabiliyyəti sayəsində kiçik elmi işçidən baş elmi işçi, şöbə müdiri, elmi işlər üzrə direktor müavini və Azərbaycan Elmlər Akademiyası Şərqşünaslıq İnstitutunun direktoru vəzifəsinədək yüksəlmişdir. 1989-cu ildə o, Tbilisi şəhərində müvəffəqiyyətlə doktorluq dissertasiyası müdafiə etmiş, filologiya elmləri doktoru elmi dərəcəsi və az sonra bu ixtisas üzrə professor adı almışdır.

Üç monoqrafiyanın ("Mixail Nüaymə və "Qələmlər birliyi", 1975; "Cübran Xəlil Cübran", 1975; "Yeni ərəb ədəbiyyatının korifeyləri", 1991), 70-dən artıq elmi məqalənin və bir çox ərəbcədən tərcümələrin müəllifi olan Aida xanım Şərq filologiyası sahəsində yazılmış onlarca elmi əsərin redaktoru olmuşdur. Azərbaycan EA Şərqşünaslıq İnstitutunda fəaliyyət göstərən "Asiya və Afrika ölkələri xalqlarının ədəbiyyatları" ixtisası üzrə müdafiə şurasına rəhbərlik etmişdir.

Professor Aida İmanquliyeva Azərbaycan şərqşünaslıq elmini dəfələrlə yaxın və uzaq xarici ölkələrdə (Moskva, Kiyev, Poltava, Sankt-Peterburq, Hamburq, Halle və s.) təmsil etmişdir.

Görkəmli alim elmi fəaliyyətinin ilk illərində Mixail Nüaymənin yaradıcılığını, fəaliyyətini izləmiş, diqqətlə araşdırmış, onun əsərlərini ədəbi elmi ictimaiyyəti tanış etməklə yanaşı, özünün ideyalarını da cəmiyyətə çatdırmışdır. Həmin dövrdə - 1970-ci illərdə Azərbaycanda həyata keçirilən böyük quruculuq işləri ilə bərabər, elmi-mədəni yeniliklər, kəşflər vasitəsi ilə yaddaşa qayıdış ruhu inkişaf etdirilirdi.

Mixail Nüaymənin yaradıcılığında qaldırılan ideyalar da bir növ bu düşüncənin başqa üzü idi. Mixail Nüaymə ərəb dünyasını, ərəb ədəbi-ictimai fikrini dirçəlişə, dünya ədəbi-fəlsəfi fikrinə söykənərək əski yaddaşa qayıtmağa çağırırdı. Şərq mənəvi dəyərlərinə sahib çıxmaq üçün soydaşlarını mənəvi kamilliyə, birliyə və dünyəvi dəyərlərə səsləyirdi. Bu ideyalar onun əsərlərində öz əksini tapırdı. Rus elminə, klassik fikrinə dərin bələd olan, formanı ondan, məzmunu, ruhu əski Şərq fəlsəfi fikrindən, müasir Avropa düşüncəsindən götürən Mixail Nüaymənin yaradıcılığından söhbət açan, dolğun mülahizələr irəli sürən Aida xanım bu böyük sənətkarın çoxşaxəli yaradıcılığı barədə deyirdi: "Mixail Nüaymə müasir ərəb novellalarının banilərindən biridir. Ərəb dünyasında bu böyük realist sənətkar nəsr və nəzm, publisistika və ədəbiyyatşünaslığa dair məqalələrin müəllifidir".

Ömrünü ərəb mühacirət ədəbiyyatının tədqiqinə həsr edən, Amerikada, Avropada yaşasalar da, öz dilini, dinini, mədəniyyətini qorumaqdan, təbliğ etməkdən zövq alan ərəb ziyalılarının yaşantılarından, duyğularından, dünyaya baxışlarından söz açan Aida xanım xalq üçün yaşayıb-yaradan, dövlətlərini nura qərq edən ziyalıların basqılara məruz qalmasının səbəblərindən danışır, onlara bir növ istiqamət də verirdi.

Görkəmli alim romantik poeziyanı onun Qərbdə C.Bayron, U.Bleyk, R.Emerson, U.Uitmen, Şərqdə C.Cübran, Ə.ər-Reyhani, M.Nüaymə kimi məşhur nümayəndələrinin timsalında araşdırmış, bir tərəfdən hiss və əqlin, digər tərəfdən Şərq ilə Qərb düşüncə tərzlərinin vəhdət məqamlarını üzə çıxararaq bəşəriyyətin məhz bu vəhdətə doğru inkişaf etmək əzmini təsbit etmişdir. Öz tədqiqatlarında da poetik ruhla fəlsəfi düşüncənin, romantizmlə realizmin sintezindən çıxış edən Aida xanım Azərbaycan ədəbi və fəlsəfi fikrində ilk dəfə olaraq Şərq və Qərb romantiklərinin müqayisəli təhlilini aparmışdır.

Aida xanımın ikinci böyük əsəri 1975-ci ildə işıq üzü görmüş "Cübran Xəlil Cübran" monoqrafiyasıdır. Uzaq Amerikada - Nyu-Yorkda ərəb ziyalılarını birləşdirən ideya və məfkurə birliyindən söhbət açan Aida xanım Cübran Xəlil Cübranın yaradıcısı, qurucusu olduğu ədəbi cəmiyyətin - "Qələmlər birliyi"nin əhəmiyyətindən söz açarkən yazıb: "Bu cəmiyyətin yaranması yeni ərəb mədəniyyətinin inkişafında görkəmli rol oynayan təzə və böyük ədəbi məktəbin meydana gəlməsi demək idi".

Alim ərəb mühacirətinin səbəblərindən, nəticələrindən danışmaqla mühacirətin dözülməz olduğunu da qeyd edir. Onların həyatına, duyğu və düşüncələrinə ayna tutan, "Qələmlər birliyi"ni yaratmaqla, Amerikaya mühacirət etmiş ərəbləri qələmin işığına toplamaqla onların ocaq, yurd ruhunun ölməməsinə şərait yaradan ziyalıları təqdir edir.

Bu ədəbi birliyin mahiyyətində siyasi motivlərin olduğunu diqqətə çatdıran Aida xanım istedadlı şair və rəssam Cübran Xəlil Cübranın təkcə ərəb ədəbi-bədii fikrində deyil, ictimai-siyasi düşüncəsində də özünəməxsus yeri olduğunu vurğulayır. Hiss və duyğuların kətana rənglərin dili ilə köçürən Cübran Xəlilin vətənpərvərlik hisslərinin bədii yazılarında, daha çox da şeirlərində öz əksini tapdığını xatırlayanda, qadını müdriklər, müqəddəslər anası kimi qiymətləndirən ərəb dünyasında Cübran Xəlilə olan ögey münasibətə etiraz edir. Qadının kölə, hüquqsuz, məzlum obrazına etiraz edən Aida xanım Şərqin bu istedadlı qələm və fırça sahibinin haqqa xidmət etdiyini bildirir. Cübran Xəlilin bu sahədəki xidmətləri barədə yazır: "Bütün əsərlərində Cübran qadının cəmiyyətdə hüquqsuz, məzlum, hətta bəzən kölə vəziyyətindən narahat olduğunu, narazı qaldığını bildirir". Hər bir əsəri, monoqrafiyası, məqaləsi ilə ərəb mühacirət ədəbiyyatını bizə bir qədər də yaxınlaşdıran Aida xanımın şərqşünas alim kimi ən böyük xidmətlərindən biri də ədəbi, elmi düşüncələrinin içərisində oxucularını özünün və dövrünün siyasi baxışları ilə tanış etməsi idi.

Aida xanım ömrünü, qüvvəsini həsr etdiyi "Yeni ərəb ədəbiyyatının korifeyləri" monoqrafiyası ilə yeni bir dünya - müasir ərəb ədəbiyyatı ilə bağlı sanballı mənbə yaratdı. 1992-ci ildə işıq üzü görən bu kitab onun elm aləminə bəxş etdiyi möhtəşəm əsər olsa da, təəssüf ki, son işi idi.

Professorun elmi-fəlsəfi düşüncələri, hadisələrə orijinal baxışı, onlara yeni məzmun və xarakter verməsi, elmi tələbkarlığı və bir o qədər də qayğıkeşliyi onun ziyalı portretinin ayrılmaz cizgiləridir. Görkəmli alimin müxtəlif illərdə dərc olunmuş əsərləri bu gün də təkcə gənc şərqşünaslar üçün deyil, ümumilikdə bu sahənin peşəkar tədqiqatçıları üçün sanballı mənbə rolunu oynayır.

Şərqşünas alim kimi yaradıcılığının 30 ilində özünə abidə ucaldan Aida xanım ərəb korifeylərinin fikirlərini, düşüncələrini tədqiqata cəlb edə-edə özü də onlardan biri olurdu. Akademik üslubla bərabər, elmi, bədii, publisistik üslubda yazan Aida xanım özünün təkcə alim, şərqşünas obrazını deyil, yazıçı, mütərcim obrazını yaradırdı. Yazdığı monoqrafiyada daha çox üç sənətkarın - Mixail Nüaymənin, Cübran Xəlil Cübranın və Əmin ər-Reyhaninin yaradıcılığını tədqiqata cəlb edən alim müasir düşüncəli bu istedad sahiblərinin simasında ərəb ruhunun ölməzliyindən, incəliyindən və ləṭafətindən söhbət açırdı. "Əmin ər-Reyhani livanlıdır. Ərəb ədəbiyyatında romantizmin banilərindən biridir. Rəngarəng janrlarda işləmişdir: O, şair, nasir, publisist, tənqidçi, tarixçi, tərcüməçidir" deyə Əmin ər-Reyhaninin hərtərəfli yaradıcılığa, dünyagörüşə malik bir şəxs olduğunu faktlarla sübut etməklə, onun simasında Şərqin kamil ziyalısının obrazını canlandırırdı.

Görkəmli şərqşünas olmaqla bərabər, mütərcim və ədəbiyyatşünas kimi də tanınan Aida xanım, eyni zamanda gözəl müəllim idi. Yazıb tədqiq etdikləri barədə fikirlərini ustalıqla auditoriyaya çatdıran Şərq mütəfəkkiri, ictimai xadimi, filosofu idi. Onun bu qüdrəti ərəb - mühacirət ədəbiyyatının müxtəlif sahələrinə həsr olunmuş məqalələrində, şəxsən özünün təşkil etdiyi konfrans və simpoziumlarda təsdiqlənirdi. Şərqşünas alimlər Ziya Bünyadov, İosif Braginski, İrina Bilık, Anna Dolinina, Aleksandr Kudelin, Valeriya Kripçenko, Malik Qarayev, İ.Filiştinski, O.Frolova dəfələrlə onun düşüncələrinə şərik çıxmış, müxtəlif vaxtlarda onun haqqında dəyərli fikirlər söyləmişlər.

Bakı Dövlət Universitetində bir zamanlar oxuduğu mühazirələrdən bəhrələnənlər söz düşəndə həmişə Aida xanımın dərin biliyindən, intellektual səviyyəsindən ağızdolusu danışırlar. Şərqşünaslıq fakültəsində ərəb ədəbiyyatından mühazirələr oxuyan Aida xanım pedaqoq alim kimi Azərbaycan, ərəb, rus və Avropa ədəbiyyatlarının müqayisəsini aparır, biri digərindən qidalanaraq formalaşan bu ədəbiyyatların bəşəriyyətə bəxş etdiyi yeniliklərdən soraq verərək müasir ərəb ədiblərinin əsərlərinin tərcümə olunmasını ədəbi-mədəni əlaqələrimizin inkişafında körpü hesab edirdi. BDU kollektivi görkəmli şərqşünasın xidmətlərini ehtiramla xatırlayır. Hazırda şərqşünaslıq fakültəsinin qabaqcıl tələbələri Aida İmanquliyeva adına təqaüd alır. Universitetdə onun elmi fəaliyyətini araşdıran müsabiqələr və konfranslar keçirilir, yubileyləri qeyd olunur. Əminik ki, böyük alimin universitetimizlə bağlı gördüyü işlər, gənc nəslin yetişdirilməsində, şərqşünaslıq elminin inkişafında göstərdiyi əvəzsiz xidmətlər gələcəkdə daha da ətraflı öyrəniləcək.

Aida İmanquliyeva hər zaman Şərqlə Qərbi mənəvi birliyə, ortaq düşüncəyə, ümumi ictimai-siyasi baxışa dəvət edirdi. Rejimin, quruluşun ideoloji təbliğatına, çərçivəsinə, təzyiqlərinə baxmayaraq, düşüncəsindən, duyğularından dönmürdü. Dünyanın qovuşacağına - ideya və məfkurə birliyinə, gələcəyinə inanırdı. Bu səbəbdən də Şərq-Qərb ədəbi-fəlsəfi, mədəni dəyərlərinin sintezindən yaranan əsərləri, onların yaradıcılarını Mixail Nüaymə, Cübran Xəlil Cübran və Əmin ər-Reyhani kimi işıqlı insanları təbliğ edirdi. Tanrının ona bəxş etdiyi istedadın, kamilliyin, gözəlliyin işığını elmimizin üstünə salan Aida xanım əhatəli yaradıcılığı ilə "Ərəb filologiyası məsələləri", "Yaxın və Orta Şərq", "Sovet şərqşünaslığının problemləri və perspektivləri", "Şərqin problemləri: tarix və müasirlik", "Romantizmin problemləri və Şərq" adlı əsərləri ilə Şərqin təkcə ədəbi-fəlsəfi yaşantısına deyil, ictimai-siyasi quruluşuna da aydınlıq gətirdi. 30 il Şərq mədəniyyətini, mənəvi dəyərlərini, ictimai-siyasi fikrini fəlsəfi düşüncəsinin işığında araşdıran, Şərq-Qərb dəyərləri kontekstində tədqiqata cəlb edən Aida xanım hələ ötən əsrin 70-ci illərində sərhədlərin

(Davamı 4-cü səhifədə)

# Böyük şərqşünas alim, bacarıqlı elm təşkilatçısı

(Əvvəli 3-cü səhifədə)

qapalı olduğu, imperiyanın hökm sürdüyü dövrdə vətəndaş, ziyalı, qüdrətli alim kimi öz sözünü deyərək insanları, dövlətləri Böyük Köç Yoluna - İpək Yoluna səsləmişdi. "Su axan yerdən bir də axar" hikmətinə tapınan Aida xanım Şərq düşüncəsi, Şərq təfəkkürü və şərqli məhəbbəti ilə Azərbaycan elminin, mədəniyyətinin ləyaqətli təmsilçisi olmuşdu. Dünyanın bir çox ölkələrinə həmin böyük Köç Yolu vasitəsi ilə qovuşan, Şərq və Qərbin ədəbi-fəlsəfi, etik və estetik dəyərlərini, düşüncə sistemlərini tədqiq etməklə Şərq filosoflarının dərin fəlsəfəsinə tapınırdı. Moskvada, Sankt-Peterburqda, Kiyevdə, Poltavada, Hamburqda, Halledə və digər neçə-neçə şəhərlərdə, elm mərkəzlərində Şərq mənəvi dəyərlərini məhv etməyə heç bir imperiyanın qüdrətinin yetməyəcəyini elmi mülahizələri ilə sübut edirdi. Ümumittifaq Şərqşünaslıq Cəmiyyəti Rəyasət Heyətinin və Ümumittifaq Koordinasiya Şurasının üzvü kimi Şərqdən ruh alan şərqşünaslara istiqamət vermək də Aida xanıma nəsib olmuşdur.

Şeyx Cəmaləddin Əfqaninin XIX yüzildə qaldırdığı ideya və məfkurə birliyi, Şərq-Qərb dəyərlərinin sintezi ideyaları XX yüzildə təsdiq məqamına qovuşduqca Azərbaycanın ilk qadın şərqşünası Aida xanım İmanquliyeva da öz sözünü deyir, bu fikirlərə dəstək olurdu. Rus imperiyasının içərilərində yaşaya-yaşaya SSRİ Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunda dissertasiya müdafiə etmək, dünyanın məşhur şərqşünaslarını razı salmaq üçün yüksək savada, ali təfəkkürə malik olmalıydın. Tarixi şərait bu qüdrətli alimin ideyalarını bütövlükdə açmağa imkan verməsə də, Aida xanım şərqşünas alim, Azərbaycan Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunun direktoru kimi məqam düşdükcə, şərait yetişdikcə sözünü deməyə cəsarət tapırdı. Zaman-zaman mənəvi terrora, hücumlara məruz qalan Şərqin, Şərq dəyərlərinin bir növ himayədarına çevrilən Aida xanım instituta yeni qədəm qoyan aspirant və dissertantları məhz Şərqin və türk dünyasının böyük dərinliklərinə istiqamətləndirir, dünyanın bu böyük sərvət və mədəniyyətindən qidalanmaq üçün onlara yol göstərirdi. XIX-XX yüzilliklərdə Cənubi Amerikaya mühacirət etmiş Suriya və Livan yazarlarının simasında ərəb-mühacirət ədəbiyyatını tədqiq edən Aida xanım mühacirəti vətəndə çürüməkdən, boğulmaqdan üstün tutan azad sözə, açıq fikrə can atmış ərəb ziyalılarının simasında Əhməd bəy Ağaoğlu, Almas İldırım, Ceyhun bəy Hacıbəyli kimi məşhur ziyalıların faciəsini sovet imperiyasının diqqətinə çatdırmaq istəyirdi. O həm də sübut etmək istəyirdi ki, Şərqin belini cəhalət qırdığı kimi, rus imperiyasının, şura hökumətinin də dizlərini insanların, millətlərin məhbəsinə dönmüş quruluş yıxacaq. Bu, 1960-cı illər idi. Cəmi 20 il sonra dünya yenidən qurulacaq, imperiya xofu millətlərin istiqlal savaşı, azadlıq istəyi ilə yoxa çıxacaqdı.

O, həmişə müqəddəs elm məbədi kimi baxdığı akademiyaya ən gənc əməkdaş kimi qədəm qoymuşdu. İş otağına çatanda öz doğmalarını, universitet auditoriyalarından tanıdığı müəllimlərini və tələbə yoldaşlarını görmüşdü. Ərəb ədəbiyyatı qrupunda kiçik elmi işçi kimi fəaliyyətə başlayan Aida xanım çox keçmir ki, baş elmi işçi dərəcəsi alır. 1976-cı ildə hər şey dəyişir. "Ərəb ədəbiyyatı qrupu"nun bazasında ərəb filologiyası şöbəsi yaranır, Aida xanım müdir seçilir. Gənc, istedadlı, Şərqi və milləti-ni sevən Aida xanımın qayğısı və rəhbərliyi ilə on nəfər aspirant və dissertant namizədlik dissertasiyası müdafiə edərək şərqşünas alim kimi yetişir.

Hadisələrin kələfinin dolaşdığı, milli azadlıq hərəkatının tüğyan etdiyi dövrdə - 1988-ci ildə Aida xanım institutun direktor müavini vəzifəsinə irəli çəkilir, bir il sonra yuxarıda qeyd etdiyimiz kimi Tbilisidə doktorluq dissertasiyası müdafiə edir. 1991-ci ildə bir çoxları çörək pulu dalınca qaçıb akademiyadan uzaqlaşdığı halda Aida xanım zərif çiyinlərini elm yükünün altına verir. Akademiyanın Rəyasət Heyətinin qərarı ilə Şərqşünaslıq İnstitutuna direktor təyin olunur.

Onun direktor olduğu illərdə Şərqşünaslıq İnstitutunda görülən işlər indi də yüksək qiymətləndirilir. Evinin, ailəsinin səliqə-sahmanını, xeyirxahlığını, ucalığını, səmimiyyətini, ülfətini götürüb institute gələn Aida xanım öz kübarlığını vəzifənin müxtəlif pillələrində də qoruyub saxladı. Rəhbərlik etdiyi dövrdə əsl ziyalı kimi fəaliyyət göstərdi. Daşıdığı vəzifəni nurlu dünyası, xeyirxah əməlləri ilə işıqlandıran Aida xanım bu səbəbdəndir ki, institut işçilərinin yaddaşında kübarlıq, xeyirxahlıq, ziyalılıq mücəssəməsi kimi qaldı.

O illərdə Şərqşünaslıq İnstitutunda hazırlanan elmi əsərlər, işıq üzü görən kitab və monoqrafiyalar, tərcümə topluları, məqalələr məcmuəsi onun bir direktor kimi təşkilatçılıq bacarığından, elmi rəhbər kimi qüdrətindən, mütərcim kimi istedadından, şərqşünas alim kimi yaddaş sevgisindən soraq verir. Həmin dövrdə "Ərəb filologiyası məsələləri" adlı məqalələr toplusu çap olunur. Aida xanımın rəhbərliyi ilə nəşrə hazırlanan bir neçə tərcümə kitabı da onun ədəbi-mədəni əlaqələrimizin inkişafına göstərdiyi böyük xidmətindən, Şərqə sevgisindən irəli gəlirdi. Aida xanımın bu illər ərzində ən böyük xidmətlərindən biri də ərəb ədiblərinin əsərlərindən ibarət "İnsan və quş" adlı hekayələr məcmuəsi, "Ağ günlərin sorağında" almanaxı çap etdirməsi idi.

Aida xanım öz əsərləri ilə Azərbaycan-ərəb ədəbi əlaqələrinin yeni mərhələsini yaratdı. Onun bu əlaqələrdən yazdığı dövrdə isə artıq bütün körpülər qırılmışdı. Bu əlaqələrin mərkəzi olmuş SSRİ dağılmışdı. Belə bir məqamda neçə-neçə şərqşünas alim yetişdirmək, elmi əsərlər, məqalələr, monoqrafiyalar çap etdirmək, konfrans və simpozi-umlar təşkil edib məruzələrlə çıxış etmək böyük şərqli istedadı, vətənpərvər ziyalılığı ilə bağlı idi. Aida xanımın Şərqşünaslıq İnstitutunun direktoru olduğu illərdə həmişə qaynar elmi mühiti ilə seçilən akademiyanın institutlarında və şöbələrində Şərqin qaranlıq gecələrinin sükutu hökm sürürdü. Çölündə isə mitinqlər. Çıxış edənlər, özünü millətə vətənpərvər ziyalı kimi tanıtmağa çalışanlar akademiyanın da sovet quruluşundan qalma bir miras kimi məhv olmasına çalışır, burada illərlə ömrünü əritmiş ziyalıları, alimləri imperiyanın nökərləri hesab edirdilər. Məhz Aida xanım kimi ziyalıların, institut rəhbərlərinin xidmətləri, qayğı və diqqəti nəticəsində bu elm məbədi məhv olmaq təhlükəsindən xilas edildi. 1993-cü ildən, ümummilli lider Heydər Əliyevin hakimiyyətə qayıdışından sonra bu böyük elm mərkəzi, müqəddəs ocaq, elm fədailərinin işıq payladığı məbəd Milli Elmlər Akademiyasına çevrilib əvvəlki şöhrətinə qayıtdı.

Azərbaycanın elm tarixinə yazılan elə qüdrətli ziyalılar, təməli halallıqdan, müqəddəslikdən qoyulan ailələr var ki, təkcə universitet onların deyil, həm də onlar universitetin alın yazısı, xoşbəxtlik payıdır. Görkəmli alimlərimiz, universitetin ilk qurucularından sayılan Əziz Əliyevin, Yusif Məmmədəliyevin, Mirzə Feyzulla Qasımzadənin, Mir Cəlal Paşayevin, Cəfər Xəndanın, Əli Sultanlının, Nəsir İmanquliyevin və digər məşhur ziyalıların həyatında, yaradıcılığında, pedaqoji fəaliyyətində, müəllim, alim, ictimai xadim kimi nüfuz qazanmasında bu təhsil ocağının, onun pillə-pillə inkişafında isə bu məşhur simaların və onların soyunun davamçısı olan övladlarının xüsusi yeri var.

Aida xanım dünyasını tez dəyişdi. 1992-ci il sentyabrın 19-da universitet özünün ləyaqətli, xeyirxah müəllimini, şərqşünaslıq elminin aparıcı simalarından birini itirdi! "Gəlimli, gedimli, son ucu ölümlü dünya"da heç kəs əbədi deyil. Əbədi olan amal və əməldir. Aida xanım özünün amalı, əməli, fitri istedadı, analitik təfəkkürü, sanballı əsərləri, yetirmələri ilə köçdü yaddaşlara!

Bu gün də onun əsərləri dönə-dönə oxunur, təhlil və tədqiq edilir, tərcümə olunur, yenidən işıq üzü görür. Elmi irsi araşdırılır və təbliğ olunur. Nə qədər ki onun alim qələmi ilə uğrunda mübarizə apardığı ideya və amallar aktuallığını itirməyib, nə qədər ki Şərq-Qərb münasibətlərində tam harmoniya bərqərar olmayıb, insanlar daim Aida İmanquliyevanın əsərlərinə müraciət edəcək, gələcək nəsillər onu həmişə minnətdarlıqla xatırlayacaqlar.

Görkəmli alimin böyük arzuları, azad Azərbaycanla bağlı düşüncələri indi qızlarının - Heydər Əliyev Fondunun prezidenti, UNESCO və ISESCO-nun xoşməramlı səfiri, Milli Məclisin deputatı Mehriban xanım Əliyevanın, elmi əsərləri ilə filoloji və fəlsəfi fikir tariximizdə yeni cığır açan AMEA-nın müxbir üzvü, professor Nərgiz xanım Paşayevanın genişmiqyaslı, möhtəşəm layihələrində həqiqətə çevrilir!

Tanrı Aida xanımı gerçəkdən xoşbəxt yaratmışdı. İstedadı, ləyaqəti, nəcibliyi və xeyirxahlığı ilə Şərq qadınlığına, ana ucalığına nümunə olan Aida xanımın ən böyük xoşbəxtliyi onun soy müqəddəsliyi, genetik kodları ilə bağlı idi. Elmi, təhsili, savadı, geniş dünyagörüşü həyatda qazanmaq olur. Bir çox digər dəyərlər isə İlahidən insana nəsib olan ən böyük səadətdir. Bu səadət Aida xanımın simasında həm də universitetimizin boyuna biçilmişdir.

**Abel MƏHƏRRƏMOV,**
**Bakı Dövlət Universitetinin rektoru, akademik**

**Vasim MƏMMƏDƏLİYEV,**
**akademik**

*"Azərbaycan" qəzeti,*
*10 oktyabr 2015-ci il*

# Tələbə Gənclər Təşkilatının təqdimatı keçirilib

Oktyabr ayının 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında universitetin Tələbə Gənclər Təşkilatının (TGT) 2015-2016-cı tədris ilində universitetə qəbul olmuş I kurs tələbələri üçün təqdimatı keçirilib. Tədbirdə ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) nümayəndəsi Şəmsi Gülverdiyev, Milli Debat Proqramının rəhbəri Canoğlan İlyasov və TGT-nin rəsmi tərəfdaşı olan "Akademiya" Tədris Mərkəzinin nümayəndələri iştirak ediblər.

Tədbirdə ilk olaraq Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib. ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor F.Rzayev çıxış edərək TGT-nin fəaliyyətini müsbət qiymətləndirib. Professor F.Rzayev gənclərə dövlət səviyyəsində yüksək qayğı və diqqət göstərildiyini, onlara müasir səviyyədə təhsil almaq, ictimai-mədəni həyatda fəal iştirak etmək, eləcə də dövlət idarəçiliyində təmsil olunmaq üçün əlverişli şəraitin yaradıldığını bildirib. O, həmçinin çıxışında gəncliyi cəmiyyətimizin mütərəqqi, aparıcı və eyni zamanda ən fəal qüvvəsi kimi səciyyələndirib, tələbə-gənclərə təhsildə və ictimai fəaliyyətdə uğurlar arzulayıb.




Sonra tədbir çıxışlar və TGT-nin bir illik fəaliyyətini əks etdirən videoçarxın nümayişi ilə davam edib, daha sonra isə ayın ən fəal fakültəsi seçilən Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinə fəxri fərman təqdim olunub.

Eyni zamanda tədbirdə Biologiya fakültəsinin tələbəsi Leyla Əhmədova, Fizika və ümumi texniki fənlər fakültəsinin tələbəsi Tərlan Musalı, Kimya fakültəsinin tələbəsi Günay Vəliyeva, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin tələbəsi Rəhiməxanım Həsənova ayın ən fəal tələbələri seçilib, onlara sertifikatlar təqdim edilib.

**Ramid SEYFULLAYEV,**
**Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin III kurs tələbəsi**



# İstedadlı metodist-alim



Son illər Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) yüksəkixtisaslı kadrların hazırlanmasında diqqətəlayiq yüksəliş hiss olunmaqdadır. Bu sahədə öz elmi-pedaqoji fəaliyyəti ilə seçilən tədqiqatçı-müəllim-lərimizdən biri də Mübariz Mirəziz oğlu Əmirovdur.

Mübariz Əmirov 1947-ci ildə Dəvəçi şəhərində (indiki Şabran şəhərində) ziyalı ailəsində anadan olub. 1973-cü ildə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) Tarix fakültəsini bitirib. 1973-1975-ci illərdə Şabran rayonunun Surra və Əmirxanlı kəndlərində tarix müəllimi işləyib. 1976-1979-cu illərdə Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun (indiki Təhsil Problemləri İnstitutu) aspiranturasının əyani şöbəsində oxuyub. 1985-ci ildə namizədlik, 2008-ci ildə doktorluq dissertasiyalarını müdafiə edib. 1987-1999-cu illərdə ETPEİ-da tarix və coğrafiyanın tədrisi metodikası şöbəsinin müdiri, 1987-ci ildən 2013-cü ilədək ADPU-nun Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasında dosent işləyib. 2014-cü ildən həmin kafedranın professorudur.

Hələ ötən əsrin 80-ci illərindən başlayaraq respublikamızda Mübariz Əmirovun imzası ilə çoxsaylı elmi məqalələr dərc edilirdi. Bu imza tarixçilərimizə çox tanışdır. Onun əsərlərindən respublikamızın ümumtəhsil və ali məktəb müəllimləri həmişə faydalanırlar.

Böyük Azərbaycan mütəfəkkiri Nəsirəddin Tusi "Əxlaqi-Nasiri" əsərində yazır: "Elm-varlıqların, həqiqətin necə olduqlarını düzgün təsəvvür etmək, insanın yaradıcı ağlı (nəfseəmr), sağlam düşüncəsi dairəsində onun xüsusiyyət və keyfiyyətlərini kəşf etməkdir. Əməl-gizli qüvvələri ortaya çıxarmaq, müxtəlif sənət və peşələrdən fayda götürmək, müxtəlif iş vərdişləri əldə etmək üçün göstərilən fəaliyyətə deyilir, bu şərtlə ki, o bəşəriyyətin qüdrətinin artmasına, onun təkmilləşməsinə səbəb olsun.




Kimdə bu iki fəzilətin hər ikisi varsa, o, ən müdrik insan, ən kamil alim hesab edilər, onun yeri bəşər övladının tuta biləcəyi ən yüksək mövqeyin fövqündə olar. Necə ki, Qurani-Kərimdə buyrulub: "Kimi istəyirsə, ona hikmət verir, kimə hikmət verirsə, ona böyük nemət bəxş edir".

Professor Mübariz Əmirovun yaradıcılığına nəzər salarkən aydın olur ki, o, ictimai elmlərin tədrisi metodikası sahəsində xüsusi yeri olan alimlərdəndir. O, respublikamızda ilk dəfə olaraq ümumtəhsil məktəblərində hüququn tədrisi metodikasını tədqiqat obyekti seçmişdir. 1985-ci ildə Tiflis şəhərində tanınmış pedaqoq-alim Əjdər Ağayevin və görkəmli hüquqşünas-alim Murtuz Ələsgərovun rəhbərlikləri altında namizədlik dissertasiyasını uğurla müdafiə etmişdir. Elə bunun nəticəsidir ki, müstəqil Azərbaycanımızın ilk Konstitusiyasının orta məktəblərdə tədrisi üçün nəzərdə tutulmuş "Azərbaycan Respublikası Konstitusiyasının əsasları" dərsliyinin müəlliflərindən biri M.Əmirov olmuşdur.

IX sinif şagirdləri üçün nəzərdə tutulmuş dərslikdə "Xalq hakimiyyəti", "Azərbaycan dövlətçiliyinin əsasları", "Əsas insan və vətəndaş hüquqları və azadlıqları", "Dövlət hakimiyyəti", Qanunvericilik hakimiyyəti", "İcra hakimiyyəti", "Məhkəmə hakimiyyəti", "Naxçıvan Muxtar Respublikası", "Yerli özünüidarəetmə", "Hüquq və qanun" məsələləri 14-15 yaşlı məktəb şagirdlərinin başa düşə biləcəyi tərzdə, sadə və aydın şəkildə şərh edilərək verilib.

M.Əmirov 1994-cü ildə ADPU-nun nəşriyyatında 8 çap vərəqi həcmində "Tarix, insan və cəmiyyət fənlərinin tədrisində şagirdlərdə siyasi mədəniyyətin formalaşdırılması üzrə işin sistemi" adlı monoqrafiyasında problemin həllinə yönəldilmiş tədqiqat metodlarından pedaqoji ustalıqla istifadə etmişdir. Monoqrafiyada ümumtəhsil məktəblərində tarix, insan və cəmiyyət fənlərinin şagirdlərdə siyasi mədəniyyəti formalaşdırma imkanları araşdırılmış, müvafiq dərs nümunələri verilmişdir. Monoqrafiyada əsas hədəf böyüməkdə olan gənc nəsildə ictimai və humanitar fənlərin tədrisi prosesində siyasi mədəniyyəti formalaşdırmaqdır.

1994-cü ildə "Təhsil" nəşriyyatında 12 çap vərəqi həcmində M.Əmirovun digər müəlliflərlə birlikdə ümumtəhsil məktəblərinin XI sinifləri üçün "İnsan və cəmiyyət" adlı yeni dərsliyi işıq üzü gördü. Dərsliyin əsas qayəsi cəmiyyətin mənəvi həyat sistermini təşkil edən başlıca elementlərin - əxlaqın, incəsənətin, dinin, hüququn mahiyyətini, yerini və rolunu, eləcə də dövlətin, tarixi şəxsiyyətlərin və siyasətin cəmiyyətdəki rolu məsələlərini XI sinif şagirdlərinə aşılamaqdır.

2003-cü ildə M.Əmirovun metodik işləmələri əsasında"Çaşıoğlu" nəşriyyatında 21 çap vərəqi həcmində "İnsan hüquqlarının tədrisi" adlı metodik vəsait çapdan çıxmışdır. Metodik vəsait X-XI sinif şagirdləri üçün nəzərdə tutulub. Bu metodik vəsaitdə insan hüquqlarının yeniyetmələr tərəfindən mənimsənilməsi, insan hüquqlarına dair biliklərin məzmunu və həmin hüquqların tətbiqinin əhəmiyyəti haqqında çox qiymətli təlim materialları verilib.

İstedadlı metodist-alim M.Əmirovun yaradıcılığında "Tarixin tədrisində şagirdlərdə siyasi mədəniyyətin formalaşdırılması üzrə işin sistemi" problemi qırmızı xətt kimi keçir. Müəllifin həmin problemin həllinə yönəldilmiş monoqrafiyasında (2004-cü il) tarixin tədrisi prosesində şagirdlərdə siyasi mədəniyyətin formalaşdırılması araşdırılır. Bu məqsədlə XX əsrin əvvəllərindən bu günə kimi ümumtəhsil məktəblərində tədris olunan tarix fənninin proqramları, dərslikləri, dərs vəsaitləri, problemə həsr olunmuş metodik ədəbiyyatlar analitik təhlilə cəlb edilmişdir. Eləcə də problemin işlənmə və məktəbdəki tətbiqi səviyyələri öyrənilərək ümumiləşdirilmişdir. Monoqrafiyada şagirdlərdə siyasi mədəniyyətin formalaşdırılmasının fəlsəfi, pedaqoji-didaktik və psixoloji əsasları tədqiq edilmişdir.




Problemin sistemli həllinə nail olmaq üçün müəllif şagirdlərdə siyasi mədəniyyətin formalaşdırılmasının məqsədini, vəzifələrini, prinsiplərini, forma və metodlarını tədqiq etmişdir. Monoqrafiyada dərsdənkənar işlərdən istifadə etməklə şagirdlərdə siyasi mədəniyyətin formalaşdırılması nümunələri verilib. Əsərdən pedaqoji institutların müəllimləri, tələbələri, doktorant və elmi işçiləri, eləcə də geniş oxucu kütləsi yetərincə yararlanır. Müəllifin doktorluq dissertasiyasının nəticələrindən artıq ali təhsilin magistratura pilləsində dərs vəsaiti kimi istifadə edilir.

Tanınmış pedaqoq-alim M.Əmirov 2008-ci ildə daha böyük uğura imza atdı. "Tarixin tədrisində şagirdlərdə siyasi mədəniyyətin formalaşması üzrə işin sistemi" mövzusunda doktorluq disertasiyasını uğurla müdafiə edərək pedaqogika üzrə elmlər doktoru elmi dərəcəsinə layiq görüldü. Respublikada ilk dəfə olaraq tarix təlimində şagirdlərdə siyasi mədəniyyətin formalaşdırılması üzrə işin elmi sistemini yaratmaqla tarixin tədrisi metodikası elminə böyük töhfə verdi.

2009-cu ildə ADPU-nun nəşriyyatında 10 çap vərəqi həcmində ali təhsilin magistratura pilləsi üçün "Orta məktəbdə tarixin tədrisinin aktual problemləri" adlı metodik vəsaiti işıq üzü gördü. Həmin metodik vəsaitdə ümumtəhsil məktəblərində tarix təliminin aşağıda sadalanan problemləri öz həllini tapıb:

1.Tarix təlimində fənlərarası əlaqədən istifadənin imkan və yolları; 2.Tarix təlimində anlayışların formalaşdırılması; 3.Tarix təlimində mətnlə işin təşkili; 4.Tarix təlimində şagirdlərin müstəqil işlərinin səmərəli təşkili; 5.Tarix təlimində təkrar dərslərinin səmərəli təşkili; 6.Tarix dərslərində kütləvi informasiya vasitələrindən istifadənin imkan və yolları; 7.Tarixin problemli təlimi; 8.Azərbaycan tarixinin təlimində dövlət atributlarından istifadə etməklə şagirdlərdə vətəndaşlıq tərbiyəsinin formalaşdırılması və s.

M.Əmirovun ali məktəblərin tarix fakültəsi tələbələri üçün "İnsan və cəmiyyət" adlı 36 çap vərəqi həcmində olan dərs vəsaiti (2010) xüsusi əhəmiyyət kəsb edir. Dərs vəsaitinin həm məzmunu, həm quruluşu, həm də tərtibatı didaktikanın bütün tələblərinə cavab verir və zəngin məzmuna malik olduğu üçün çoxsaylı oxucuları tərəfindən maraqla qarşılanır. Vəsaitdə fənnin proqramı və terminlər lüğəti də verilib.

Ön sözlə başlanan vəsait XIV fəsildən, 80 paraqrafdan ibarətdir. Təlim materialları məntiqi və xronoloji ardıcıllıqla verilib. Müəllif dərs vəsaitində aşağıdakı problemlərə xüsusi diqqət yetirib:

1)İnsan təbiətin övladı, cəmiyyətin üzvüdür; 2) İnsan insanlar arasında; 3) Əxlaq; 4) Siyasət, onun yaradıcıları və icraçıları; 5) İnsan və vətəndaş; 6) İnsan və iqtisadi həyat; 7) İnsan inkişafı; 8) İnsan və vətəndaşın hüquq və vəzifələri; 9) Hüquq və dövlət; 10) Qanun və dövlət; 11) Demokratiya və cəmiyyət; 12) Demokratik cəmiyyətdə seçkilər; 13) Cəmiyyətin mənəvi həyatı; 14) Bəşəriyyətin qlobal problemləri.




Dərs vəsaitində ümumi şəkildə insan-təbiət, insan-cəmiyyət münasibətlərinə aydınlıq gətirilir, təbiətin və cəmiyyətin mahiyyəti kimi problemlər işıqlandırılır.

Onun 2014-cü ildə ali təhsilin bakalavriat pilləsinin tarix müəllimliyi ixtisası üçün 43 çap vərəqi həcmində "Ümumtəhsil məktəblərində tarixin fəal/interaktiv təlimi metodikası" adlı dərs vəsaiti xüsusi əhəmiyyət kəsb edir. Qeyd edək ki, bu, respublika ali məktəblərinin tarix fakültəsi tələbələri üçün yeganə dərs vəsaitidir. Dərs vəsaiti 31 bölmədən, 70 yarımbölmədən, tarix təlimi metodikasında işlədilən terminlər lüğətindən və tarixin tədrisi metodikası fənni üzrə təlim materiallarının təxmini bölgüsünü əks etdirən cədvəldən ibarətdir.

Dərs vəsaitində məktəbdə tarix təlimi metodikası - pedaqoji fənlərdən biri kimi, ümumtəhsil məktəblərində tarix təhsilinin inkişaf mərhələləri, tarixin təlimi metodikası elminin inkişafı, ölkəmizdə təhsil sistemi, tam orta təhsil səviyyəsində tarix təliminin müasir sistemi məsələləri sadə şəkildə şərh edilib, məktəbdə tarix təlimi prosesi, məktəb tarix dərsliyi, tarix təliminin idrakı, psixoloji və didaktik əsasları, şagirdlərdə tarixi təsəvvürlərin yaradılması - tarixi biliklərin mənimsənilməsinin əsas vasitəsi kimi, anlayışların formalaşdırılması, tarixi proses və ictimai inkişaf qanunauyğunluqlarının mənimsənilməsi, təlim metodları, əyani təlim metodu, şifahi təlim metodu, nəşr edilmiş mətnlərlə iş, təlimdə fənlərarası və fəndaxili əlaqələrdən istifadə məsələləri aydın və anlaşıqlı şəkildə izah edilmişdir.

Həmçinin dərs vəsaitində yeni təlim üsullarının məzmunu, məqsədi, vəzifələri, quruluşu, onun üstünlükləri, fəal dərsin planlaşdırılması qaydaları və fasilitasiya bacarığı, fəal dərsin mərhələləri və həyata keçirilməsi qaydaları, fəal\interaktiv təlimin üsulları, iş formaları və texnikaları, eləcə də tarix təlimində yeni texnologiyalardan istifadə məsələləri geniş şəkildə işıqlandırılmışdır.

Dərs vəsaiti şagirdlərdə mənəvi tərbiyənin formalaşdırılması, şagirdlərin bilik və bacarıqlarının yoxlanılması və qiymətləndirilməsi, testlə sorğu, məktəbdə tarix kabineti, tarix üzrə dərsdənkənar işlər və tarix müəllimi haqqında materiallarla tamamlanır.

Müəllifin yaradıcılığında ali təhsilin magistratura pilləsi üçün proqram və dərsliklərin hazırlanması önəmli yer tutur. "Tarix dərslərində şagirdlərdə elmi dünyagörüşün formalaşdırılması" adlı (2014) dərs vəsaiti xüsusi əhəmiyyət kəsb edir. Dərs vəsaitində fənnin proqram materiallarının təxmini bölgüsü verilib.

3 fəsil, 12 yarımfəsildən ibarət dərs vəsaitində fəlsəfi ədəbiyyatda dünyanın dərki probleminin işlənmə səviyyəsi, fənnin obyekti, predmeti, məqsədi, təlim-tərbiyəvi vəzifələri tədqiq edilərək ümumiləşdirilmişdir. Vəsaitdə idrakın struktur səviyyələri - yaradıcılıq və intuisiya məsələlərinə yetərincə yer verilib.

Dərs vəsaitində elmi idrak, onun formaları və metodları şərh edilir. Dünyagörüşün mahiyyəti, strukturu və tarixi tiplərinə aydınlıq gətirilib. Fəlsəfi dünyagörüşün xüsusiyyətləri və əsas məsələsi sadə və aydın şəkildə izah edilib. Elmin cəmiyyətdəki rolu, funksiyaları və inkişaf qanunauyğunluqları haqqında materiallar sistemli şəkildə ümumiləşdirilmişdir.

Dərs vəsaitində tarixdən müasir məktəb kurikulumlarının problem baxımından təhlili, tarix dərslərində şagirdlərdə elmi dünyagörüşün formalaşdırılmasının prinsipləri, forma və metodları, elmi dünyagörüşlə əqli tərbiyənin qarşılıqlı əlaqəsi məsələləri əsaslı şəkildə işıqlandırılıb.




Magistrantlar üçün nəzərdə tutulmuş dərs vəsaitində yeni təlim texnologiyalarının tətbiqi ilə tarixi proses və ictimai inkişaf qanunauyğunluqlarının mənimsənilməsi prosesində şagirdlərdə elmi dünyagörüşün formalaşdırılması, V-XI siniflərdə Azərbaycan tarixinin tədrisində şagirdlərdə elmi dünyagörüşün formalaşdırılmasına xidmət edən dərs nümunələri verilmişdir. Dərs vəsaitinin yüksək məziyyətləri onun magistrantlar tərəfindən çox maraqla qarşılanmasına motiv yaradıb. Haqqında bəhs etdiyimiz vəsaitin əsas səciyyəvi cəhəti məktəb tarix kurslarının şagirdlərin dünyagörüşü baxımından təhlil edilərək, həmin imkanları üzə çıxarmasıdır. Müəllif məhz həmin imkanlardan ustalıqla istifadə edərək şagirdlərdə dünyagörüşün formalaşdırılması üzrə işin sistemini yaratmışdır.

M.Əmirovun "Tarix üzrə dərsdənkənar iş" adlı metodik vəsaiti həm ali təhsilin bakalavriat, magistratura və doktorantura hazırlıqları, eləcə də tarix müəllimləri üçün nəzərdə tutulmuşdur.

Metodik vəsaitdə dərsdənkənar tədbirlərin təhsil-tərbiyəvi əhəmiyyəti, problemin tədqiqi səviyyəsi, mənbələri, xüsusiyyətləri, mahiyyəti və təşkili formaları, dərsdənkənar məşğələlərin məzmununa görə seçilməsi və həmin məşğələlərin müasirliklə əlaqələndirilməsi, məktəbdə diyarşünaslıq işinin təşkili, tədqiqat metodundan dərsdənkənar iş forması kimi istifadə edilməsi məsələlərinə aydınlıq gətirilmişdir.

Metodik vəsaitin səciyyəvi cəhətlərindən biri də məktəbdə şagirdlər tərəfindən muzeylərin və zalların diyarşünaslıq materialları ilə zənginləşdirilməsinə diqqətin yönəldilməsidir.

Müəllif dərsdənkənar işin çox işlənən növlərinə - tarixdən fakültativ məşğələlərin, sinifdənxaric oxunun, elmi seminarların, tarix dərnəklərinin və viktorinaların təşkili nümunələrinə geniş yer verib. Metodik vəsaitdə dərsdənkənar tədbirlər prosesində şagirdlərdə hərbi vətənpərvərlik tərbiyəsinin formalaşdırılmasının zəruri şərtləri, ümummilli liderimiz Heydər Əliyevin Azərbaycanda ordu quruculuğu sahəsindəki fəaliyyəti nümunəsində sadə və aydın şəkildə şərh edilmişdir.

Vəsaitdə xüsusi əhəmiyyət kəsb edən materiallar arasında respublikada məktəbdənkənar tərbiyə müəssisələrinin şəbəkəsinin verilməsi, eləcə də dərsdənkənar tədbirlərdə şagirdlərdə siyasi mədəniyyətin və təlim ekskursiyaları və muzeylərdə dərslərin təşkili ilə vətəndaşlıq tərbiyəsinin formalaşdırılması məsələlərinin işıqlandırılmasıdır.

Professor M.Əmirovun 2 monoqrafiyası, 1 dərsliyi, 3 dərs vəsaiti, 2 metodik vəsaiti, 100-dən çox jurnal və 200-dən çox qəzet məqaləsi, çoxsaylı proqramları tarix müəllimlərimiz tərəfindən böyük maraqla qarşılanır.

M.Əmirovun həyat və yaradıcılığına nəzər yetirdikdə aydın olur ki, o, istedadlı tədqiqatçı, peşəkar metodistdir. Onun uğurlarını motivləşdirən əsas amillərdən biri də tarixi, coğrafiyanı, ədəbiyyatı, fəlsəfəni, hüququ, pedaqogika və psixologiya elmlərini yetərincə bilməsidir. Öz həyatını imkanı daxilində çox uğurlu planlaşdırıb, demək olar ki, səmərəsiz illəri çox az olub. M.Əmirov həm özünə, həm də digərlərinə qarşı çox tələbkardır. Ən səciyyəvi cəhəti ədalətlilik, dözümlülük, inadkarlıq, optimizm, cavabdehlik, fəallıq və intizamlılıqdır. O, yüksək əxlaqi keyfiyyətlərə malik şəxsiyyət, dövlətə, dövlətçiliyə xidməti ilə seçilən ziyalıdır.

Professor M.Əmirov bu vaxta qədər tarixin tədrisi metodikası ixtisası üzrə 5 nəfər elmlər namizədi, həmçinin çoxlu sayda magistr hazırlayıb. Hazırda 3 nəfər pedaqogika üzrə fəlsəfə doktoru, 2 nəfər isə elmlər doktoru iddiasında olanların rəhbəridir. Onun tarixin tədrisi metodikası elminin inkişafında mühüm xidmətləri var. Mübariz müəllimin mənalı həyat yolu, səmərəli elmi-pedaqoji fəaliyyəti gənclərimizə nümunədir. Professor M.Əmirova möhkəm cansağlığı, uzun ömür, elmi-pedaqoji fəaliyyətində yeni-yeni uğurlar arzulayırıq.

**Mais ƏMRAHOV,**
**tarix üzrə elmlər doktoru, professor**

# Xatirəsi həmişə qəlbimizdə yaşayacaq...



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kollektivinə ağır itki üz verdi. İstedadlı və təcrübəli pedaqoq-alim, Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının dosenti Bilal Hümbət oğlu Muradov vəfat etdi. Onun ölümü ilə pedaqoji ictimaiyyət gözəl bir metodistini, yüzlərlə insan yaxın dostunu, çoxlu sayda tələbə sevimli müəllimini itirdi.

İnsan dünyasını dəyişəndə onun haqqında xoş sözlər demək bir adətə çevrilmişdir. Amma bu xoş sözlər Bilal müəllimin sağlığında da kafedra və Elmi Şuranın iclaslarında, radio və televiziya verilişlərində ürəkdən deyilirdi. Çünki bəstəboy, qarayanız, sakit təbiətli bu insan içində tükənməz bir xəzinə gəzdirirdi. O, bu xəzinəni işığa çevirib tələbələrinə, dostlarına paylayırdı. Onun içindəki xəzinə ömrünün sonuna qədər azalmadı, əksinə, artdı, zənginləşdi.

İstedadlı metodist-alim B.Muradov mənalı və şərəfli bir ömür yolu keçdi. O, 1931-ci ildə Qərbi Azərbaycanın Vedi mahalının Kolanı kəndində doğuldu. 1956-cı ildə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) Filologiya fakültəsini fərqlənmə diplomu ilə bitirdi. 1962-ci ildə "Orta məktəbin yuxarı siniflərində ədəbi obrazların təhlili metodikası" mövzusunda namizədlik dissertasiyasını uğurla müdafiə etdi.

1958-1967-ci illərdə "Azərbaycan Televiziya və Radio Verlişləri"Qapalı Səhmdar Cəmiyyətində böyük redaktor, baş redaktorun müavini və baş redaktor vəzifələrində çalışdı. Beynəlxalq icmalçı kimi hər kəs onu dinləməyə can atır, zəngin mütaliəsindən, məntiqli nitqlərindən faydalanmağa çalışırdı.

1967-1971-ci illərdə Azərbaycan Dillər Universitetində dosent və həmin universitetin "Bilik" qəzetinin redaktoru vəzifələrində çalışdı. 1971-ci ildən ömrünün sonuna qədər ADPU-nun Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının dosenti kimi fəaliyyət göstərdi. Eyni zamanda jurnalist fəaliyyətini də davam etdirdi.

1980-1989-cu illərdə ADPU-nun Filologiya fakültəsinin dekanı vəzifəsində işlədi. Çalışdığı müddət ərzində B.Muradovun ucadan danışdığını, qəzəbli simasını görən olmadı. Həm müəllim kimi, həm də dekan olduğu müddətdə tələbələrin ümid yerinə çevrildi. Çünki onun atalıq, qardaşlıq və dostluq duyğularına inanırdılar.

Bilal müəllim görkəmli alim idi. "Ədəbiyyatın tədrisi metodikasının nəzəri əsasları" (1980), "Orta məktəbdə ədəbi əsərlərin öyrədilməsi (1992), "Füzuli və Nəsiminin tədrisi" (2001), "Ədəbiyyat dərslərinin təşkili problemləri" (2012) və s. kimi qiymətli dərs vəsaitlərinin və monoqrafiyaların müəllifidir.

B.Muradovun simasında biz istedadlı alimi, bacarıqlı təşkilatçını, yaxşı bir müəllimi itirdik. Bilal müəllimin şəxsində mən yaxın dostumu, sirdaşımı, məsləhətdaşımı itirdim. Onun xatirəsi hamımızın qəlbində əbədi yaşayacaqdır. Allah Bilal müəllimə rəhmət eləsin!

**Zahid Xəlil,**
**Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, filologiya üzrə elmlər doktoru, professor**

# Müəllimlərimiz beynəlxalq tədbirdə iştirak ediblər



21-25 sentyabr 2015-ci il tarixində Finlandiyanın Saymen Tətbiqi Elmlər Universitetində "Saymen çağırır" adlı beynəlxalq həftə keçirilib. Qeyd edək ki, bu beynəlxalq tədbirdə Avropanın 27 ölkəsindən dəvət almış və ustad dərsləri nümayiş etdirən qabaqcıl müəllimlər bir araya gəlib.

Məlumat üçün bildirək ki, dəvət əsasında həmin həftədə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, həmin kafedranın dosenti, Əməkdar müəllim Tamilla Vahabova, baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru Mələk Zamanova da iştirak ediblər.



Beynəlxalq həftənin başlanğıcında Saymen Tətbiqi Elmlər Universitetinin rektoru xanım Anneli Pirttila tədbir iştirakçılarını salamlayıb və ilk dəfə olaraq Azərbaycandan nümayəndə heyətinin iştirak etdiyini vurğulayıb.

Bu beynəlxalq tədbirdə dosent Y.Rzayeva, dosent T.Vahabova və baş müəllim M.Zamanova mühazirə və seminar dərsləri daxil olmaqla 20-dək dərsdə iştirak edərək Avropanın qabaqcıl müəllimlərinin Saymen Tətbiqi Elmlər Universitetinin tələbələrinə müasir informasiya-kommunikasiya texnologiyalarının səmərəli tətbiqi yolu ilə həm mühazirə, həm də seminar məşğələləri vasitəsilə keçdikləri ustad dərsləri dinləmiş, qeydlər götürmüşlər. Universitetimizin əməkdaşları müzakirələrdə fəal iştirak etməklə yanaşı, həmin dərslərə öz münasibətlərini bildirmiş və müvafiq sertifikatlar almışlar.

Beynəlxalq həftənin sonunda Saymen Tətbiqi Elmlər Universitetinin Turizm fakültəsinin tələbə-gənclərinin təhsil aldıqları kampusda tədbirə yekun vurulub. Tələbələrin yüksək səviyyəli xidməti və özfəaliyyəti ilə müşayiət olunan tədbirdə universitetin rektorunun yekun çıxışından sonra dosent Y.Rzayeva çıxış edərək beynəlxalq həftəyə dəvət aldıqlarına və bu mühüm tədbirdə iştirak etdiklərinə görə öz minnətdarlığını bildirib. Dosent Y.Rzayeva eyni zamanda ADPU-nun rəhbərliyi adından xatirə hədiyyələri təqdim edib, yaradılmış bu əlaqələrin gələcəkdə daha da genişləndiriləcəyinə və səmərəli olacağına ümidvar olduğunu qeyd edib.

**Könül NƏZƏROVA**

# "TARİXİ İPƏK YOLU VƏ NAXÇIVANIN İQTİSADİ-MƏDƏNİ ƏLAQƏLƏRİNİN İNKİŞAFI MƏSƏLƏLƏRİ" MÖVZUSUNDA BEYNƏLXALQ "İPƏK YOLU" KONFRANSI

Bu il oktyabr ayının 16-17-də Naxçıvanda-Azərbaycanın bu qədim şəhərində "Naxçıvan" Universiteti, AMEA-nın Naxçıvan Bölməsi, Naxçıvan Dövlət Universiteti və Türkiyənin Ərdahan Universitetinin birgə beynəlxalq konfransı keçirildi. Tədbir öz möhtəşəmliyi ilə diqqəti cəlb edirdi. Təşkilatçılıq işi yüksək səviyyədə qurulmuşdu. Konfransda Azərbaycandan, Türkiyədən, Qazaxıstandan, İrandan və başqa ölkələrdən olan elm xadimləri iştirak edirdilər.

Beynəlxalq konfrans öz işinə ulu öndər Heydər Əliyevin abidəsi önünə gül dəstələrinin qoyulması və Heydər Əliyev muzeyi ilə tanışlıqla başladı.

Konfransın açılış və plenar iclasında giriş sözü ilə "Naxçıvan" Universitetinin rektoru, professor İsmayıl Əliyev, "Naxçıvan Azərbaycanda dövlət yaranmasınadək olan dövrdə (ən qədim zamanlardan-e.ə. IV minilliyədək)" mövzusunda AMEA-nın Naxçıvan Bölməsinin sədri, AMEA-nın həqiqi üzvü, professor İsmayıl Hacıyev, "Türk-sovet əlaqələrinin qurulmasında Naxçıvan faktoru" mövzusunda Ərzurum Atatürk Universitetinin professor-doktoru İbrahim Atnur, "İpək yolu ticarət əlaqələrinin Naxçıvanda kənd təsərrüfatının inkişafında rolu" mövzusunda Naxçıvan Dövlət Universitetinin rektoru, AMEA-nın müxbir üzvü, professor Saleh Məhərrəmov, "İpək yolu üzərində təhsilin inkişafının yeni üfüqləri": "Qafqaz Universitetlər birliyi" mövzusunda Ərdahan Universitetinin prorektoru, professor-doktor Orhan Söyləməz və "Türküstan




şəhərinin qədim içqalası (Cənubi Qazaxıstan): memarlıq, tipologiya, tarix" mövzusunda Qazaxıstan MEA-nın Etnoqrafiya İnstitutunun professoru Erbulat Smaqulov çıxış etdilər.

Sonra beynəlxalq konfrans öz işini bölmə iclaslarında davam etdirdi. Bölmə iclaslarında müxtəlif mövzularda 150-ə yaxın məruzə dinlənildi. Məruzələr ətrafında səmərəli müzakirələrin aparılması konfransın daha canlı,daha maraqlı olmasına şərait yaratdı.

Beynəlxalq konfransın ən maraqlı cəhətlərindən biri də "Naxçıvan" Universitetinin rektoru,professor İsmayıl Əliyevin təşəbbüsü ilə konfrans iştirakçılarının universitetin tələbə-gəncləri ilə görüşünün keçirilməsi oldu. Qazaxıstanlı professor Erbulat Smaqulov, Türkiyədən gəlmiş professor-doktor Kerem Karabulud və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Azərbaycan dilçiliyi kafedrasının dosenti, filologiya üzrə elmlər doktoru Həcər Hüseynova ustad dərsləri keçdilər.

Qeyd edək ki, dosent H.Hüseynovanın "Mir Cəlalın bədii əsərlərinin dil və üslub xüsusiyyətləri" mövzusunda mühazirəsi maraqla dinlənilmiş,tələbələrlə birgə xatirə şəkilləri çəkdirilmişdir.

Oktyabrın 17-də beynəlxalq konfrans öz işini bölmələrdə davam etdirmiş, iştirakçılara konfransın şəhadətnamələri təqdim edilmişdir. Həmin gün konfrans iştirakçılarının Naxçıvanın tarixi məkanlarına gəzintiləri də təşkil edilmişdir.Nuh peyğəmbərin məzarı, Naxçıvan qalası, Hüseyn Cavidin məqbərəsi, Xan sarayı Dövlət Tarix Memarlıq Muzeyi, Möminə Xatun və Açıq Səma Altında Muzey Kompleksi, Duzdağ Fizioterapiya Mərkəzi və başqa yerlərə gəzintilər tədbir iştirakçılarında dərin təəssürat yaratmışdır.

**Almarə ABBASOVA,**
**Elm və innovasiyalar şöbəsinin mütəxəssisi**

# Sizi həmişə xatırlayacağıq...

*Əziz müəllimim Şavər xanım Talıbovanın xatirəsinə həsr edirəm*



Həyatda çox ağır zərbələr almışam 6 yaşımda anamı itirərkən, 29 yaşımda qardaşım şəhid olarkən və s. Bu siyahını uzatmaq da olar. Ancaq bu il sentyabr ayının 28-də qəfil aldığım kədərli xəbər həmin itkilərdən biri kimi bütün varlığımı sarsıtdı: nəcib və xeyirxah insan, istedadlı və təcrübəli pedaqoq-alim, Hesablama riyaziyyatı və informatika kafedrasının dosenti Şavər Talıbova vəfat etmişdi...

Onu ilk dəfə II kursda oxuyarkən tanımışdım. "Hesablama riyaziyyatı" fənnindən mühazirə deyərkən gözəl bir xanım müəllimə kimi hamımızı heyrətə salmışdı. Ağbəniz sifəti ay kimi işıq saçır, uzun saçları hündür boy-buxununa xüsusi yaraşıq verirdi. Mühazirəni elə ustalıqla, peşəkarlıqla oxuyurdu ki, sanki hesablama metodlarını özü kəşf etmişdi, heç bir mənbəyə baxmadan, səlis, aydın, ardıcıl və ciddi

Amma səmimiyyəti və xeyirxahlığı ciddi görkəmi ilə ziddiyyət təşkil edirdi. Yaxşı oxuyan, eləcə də imkansız ailədən olan tələbələrə tam səmimi və mehriban yanaşırdı. Dərs dediyi tələbələrin hamısına öz övladları kimi baxırdı. Bu xarakterlə də bütün tələbə yoldaşlarımızın yaddaşında daim qalmışdı.

Taleyim elə gətirdi ki, mən özümə ideal bildiyim Şavər müəllimə ilə sonralar düz 25 il çiyin-çiyinə çalışdım. O, yenə də həmişəki kimi mənə xüsusi qayğı göstərirdi. Mənə "qardaşoğlu" deyə müraciət edirdi, ondan sözün həqiqi mənasında ana qayğısı görürdüm. Verdiyi məsləhətlər, öyrətdiyi bilik və təcrübə əsl müəllim, alim və böyük ana köməyi idi. Mənə daim ruh vermiş, uğurlarımı dəstəkləmiş və hamıdan qabaq təbrik etmişdi.

Namizədlik və doktorluq dissertasiyalarımın müdafiəsində öz əməkhaqqından aldığı gül buketini də səxavətlə hazırlatdırmış, ürəklə təqdim etmişdi. İndi etdiyi yaxşılıqlar ürəyimi göynədir, göz yaşlarımı axıtmaqla təsəlli tapıram

Təqaüd yaşı çatdığı üçün öz ərizəsi ilə təqaüdə çıxmışdı. Ancaq kollektivdən heç ayrılmırdı. Mütəmadi olaraq kafedra üzvlərinin xeyir-şərində də iştirak edirdi. Özü eşidən kimi, hamımızın sevincinə və kədərinə şərik olurdu.

Bu günlərdə eşitmişdi ki, oğlumun toyu olacaq, mənə xəbər göndərmişdi ki, onu mütləq toya dəvət edim. Düzü, utandım, onu narahat etmək istəmədim, çünki o, dəfələrlə bizim xeyir işlərimizdə yaxından iştirak etmişdi. Ona görə utandım, toydan sonra - Qurban bayramında da görüşmədik, telefonla da təbrik edə bilmədim. Demə, bu son görüş olacaqmış

Qismət olmadı

Əziz müəllimim, son görüşümüz baş tutmadı. Lakin sizin işıqlı, əziz xatirəniz mənim və eləcə də sizi sevən, tanıyan bütün insanların qəlbində daim yaşayacaq. Allah sizə rəhmət etsin!

Sizi heç vaxt unutmayacaq tələbələrinizdən biri:

**Əbülfət PƏLƏNGOV,**
**Hesablama riyaziyyatı və informatika kafedrasının professoru**

# Əməkdaşımız universitetimizi beynəlxalq tədbirlərdə uğurla təmsil edib

Oktyabr ayının 7-də Bakı şəhərində Gənc Alim, Aspirant və Magistrlər Cəmiyyətinin təşkilatçılığı, Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondunun dəstəyi və Avro-




pa Gənc Alimlər Şurasının (EURODOC) tərəfdaşlığı ilə "Avropa gənc alimlərinin genosid faktlarına baxışları" mövzusunda beynəlxalq forum keçirilib. Azərbaycan Gənc Alim, Aspirant və Ma-



gistrlər Cəmiyyətinin sədri İlqar Orucov beynəlxalq forumu giriş sözü ilə açaraq, forum barədə məlumat verib. Sonra Azərbaycan Respublikası Prezidenti Administrasiyasının İctimai-siyasi məsələlər şöbəsi müdirinin müavini Tahir Süleymanov, Azərbaycan Respublikası millətlərarası, multikulturalizm və dini məsələlər üzrə Dövlət müşaviri xidmətinin baş məsləhətçisi Etibar Nəcəfov, Milli Məclisin deputatı Adil Əliyev, Ombudsman Aparatının şöbə müdiri Zaur Əliyev, "EURODOC"un sabiq rəhbəri Slobodan Radiçev və başqaları çıxış edərək, forumun əhəmiyyətində söz açıblar. 18 ölkədən 20-dək gənc alimin iştirak etdiyi forumda universitetimizi ADPU-nun "Türk araşdırmaları" elmi-tədqiqat mərkəzinin (ETM) elmi işçisi Leyla Kərimova təmsil edib. Leyla Kərimova adıçəkilən forumda ingilis dilində "Azərbaycana qarşı törədilmiş iki böyük soyqırımı: 31 mart və Xocalı soyqırımı" mövzusunda məruzə ilə çıxış edib.

Tədbirin sonunda forum iştirakçıları beynəlxalq təşkilatlara və dünya elmi ictimaiyyətinə müraciət qəbul ediblər.

23-24 oktyabr 2015-ci il tarixində isə Türkiyə Respublikasının İstanbul şəhərində Uşaq və Gənclik Yazarları Birliyinin təşkilatçılığı ilə II Beynəlxalq Uşaq və Gənclik Ədəbiyyatı Simpoziumu keçirilib. Simpoziumda bir çox ölkələrdən alim və tədqiqatçılar iştirak ediblər. Həmin simpoziumda da ADPU-nu "Türk araşdırmaları" ETM-in elmi işçisi L.Kərimova təmsil edib. Uşaq və Gənclik Yazarları Birliyinin sədri Bican Veysel Yıldız simpoziumu giriş sözü ilə açaraq, tədbir iştirakçılarına uğurlar arzulayıb. Sonra bir sıra ölkələrin nümayəndələri tədbirin giriş hissəsində çıxış edərək, simpozium iştirakçılarına müvəffəqiyyət arzulayıblar. Daha sonra II Beynəlxalq Uşaq və Gənclik Ədəbiyyatı Simpoziumu bölmə iclaslarında öz işini davam etdirib. L.Kərimova bu simpoziumda türk dilində "Mehmet Akif Ersoy əsərlərinin uşaq və gənc qəhrəmanlarının mənəvi dünyası" mövzusunda məruzə ilə çıxış edib. L.Kərimovanın çıxışı bəyənilib və o, fəxri fərmanla təltif edilib. Qeyd edək ki, simpozium çərçivəsində keçirilən sərgidə L.Kərimovanın kitabları da nümayiş etdirilib.

**Aynurə Babayeva,**
**"Türk araşdırmaları" ETM-in əməkdaşı**

# ADPU-da "İlk dəfə səs verən gənclərin seçki maarifləndirməsi" mövzusunda tədbir keçirilib



Oktyabr ayının 29-da Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının maliyyə dəstəyi və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) təşkilatçılığı ilə universitetin "Heydər Əliyev məktəbinin lektoriyası" nda "Gənc Beynəlxalq Hüquqşünaslar" İctimai Birliyinin və "Zəngin Azərbaycan Uğrunda" İctimai Birliyinin nümayəndələrinin iştirakı ilə "Gənc seçici aylığının keçirilməsi" layihəsi çərçivəsində "İlk dəfə səs verən gənclərin seçki maarifləndirməsi" mövzusunda tədbir keçirilib.

"Zəngin Azərbaycan Uğrunda" İctimai Birliyinin sədri, ADPU-nun Fəlsəfə və sosial fənlər kafedrasının baş müəllimi İradə Əliyeva tədbiri giriş sözü ilə açaraq bu tədbirin



mühüm əhəmiyyət kəsb etdiyini bildirib. Baş müəllim İradə Əliyeva qeyd edib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin imzaladığı müvafiq Sərəncama əsasən noyabr ayının 1-də Milli Məclisə növbəti seçkilər keçiriləcək. Parlament seçkilərində 18 yaşı yenicə tamam olmuş tələbə-gənclər də səs verəcəklər. Bu baxımdan, onların seçki prosesi ilə bağlı maarifləndirilməsi olduqca vacibdir.

"Universitet Təhsilli Qadınlar Cəmiyyəti" nin sədri, "Gənc Beynəlxalq Hüquqşünaslar" İctimai Birliyinin adıçəkilən layihə üzrə eksperti, Bakı Dövlət Universitetinin dosenti Tamam Cəfərova tədbirdə çıxış edərək həyata keçirilən layihənin mahiyyəti barədə məlumat verib, dövlətimizin gənclər siyasəti haqqında danışıb. Dosent T.Cəfərova Azərbaycan Respublikasının Konstitusiyasına və Seçki Məcəlləsinə istinad edərək bildirib ki, ölkəmizdə dövlət hakimiyyətinin yeganə mənbəyi Azərbaycan xalqıdır. Ölkə vətəndaşlarının cəmiyyətin və dövlətin siyasi həyatında iştirak etmək hüququ vardır. Eyni zamanda vətəndaşların dövlətin idarə olunmasında iştirak etmək hüququ vardır ki, bu hüququ onlar bilavasitə və ya nümayəndələr vasitəsilə həyata keçirə bilərlər. Vətəndaşların dövlət orqanlarına seçmək və seçilmək, habelə referendumda iştirak etmək hüququ vardır. Seçki Məcəlləsinə əsasən irqindən, milliyyətindən, dinindən, dilindən, cinsindən, mənşəyindən, əmlak vəziyyətindən, qulluq mövqeyindən, əqidəsindən, siyasi partiyalara,həmkarlar ittifaqlarına və başqa ictimai birliklərə mənsubiyyətindən və ya digər statusundan asılı olmayaraq, vətəndaşların seçmək, seçilmək və referendumda iştirak etmək hüququ vardır. Vətəndaşlar seçkilərdə və referendumda bərabər əsaslarla iştirak edirlər. Hər bir səsvermə zamanı hər bir vətəndaşın bir səsi vardır. Vətəndaşların hər bir səsi eyni hüquqi qüvvəyə malikdir. Vətəndaşlar seçkilərdə namizədin lehinə, referendumа çıxarılan məsələnin lehinə və ya əleyhinə şəxsən səs verirlər. Başqa səxslərin yerinə səs vermək qadağandır. Başqalarının əvəzinə səs verən və ya bunun üçün şərait yaradan vətəndaşlar Cinayət Məcəlləsində və ya İnzibati Xətalar Məcəlləsində göstərilən məsuliyyətə cəlb olunurlar. Seçkilər və referendum zamanı səsvermə gizli olmalıdır, bu isə seçicilərin iradəsinin ifadəsi üzərində hər cür nəzarəti istisna etməlidir. Milli Məclisə seçkilərin, prezident seçkilərinin, bələdiyyələrə seçkilərin, referendumun keçirilməsi günü (həmin gün də daxil olmaqla) 18 yaşına çatmış hər bir vətəndaşın seçmək, referendumda səsvermək, seçkilərin (referendumun) gedişini müşahidə etmək, seçkiqabağı (referendumqabağı) təşviqatda iştirak etmək, Seçki Məcəlləsində nəzərdə tutulmuş seçki hərəkətlərində və referendumun hazırlanması ilə bağlı hərəkətlərin həyata keçirilməsində iştirak etmək hüququ vardır.

Tədbirdə tələbə-gənclərə maarifləndirici broşüralar paylanılıb, onların Seçki Məcəlləsi və seçki prosesi ilə bağlı sualları cavablandırılıb.

**Gülnar SÜLEYMANOVA**

# Kitabxanamız zənginləşir

1.İlham Əliyev "İnkişaf - məqsədimizdir". On doqquzuncu kitab. Avqust 2006- oktyabr 2006. Bakı, " Azərnəşr", 2014, 392s.

Azərbaycan Respublikasinin Prezidenti İlham Əliyevin oxuculara təqdim olunan "İnkişaf - məqsədimizdir" çoxcildliyinin bu cildində ölkəmizin iqtisadi, siyasi, mədəni həyatına, regionların sosial - iqtisadi inkişafına və problemlərinə həsr olunmuş çıxış və nitqləri, göstərişləri öz əksini tapmışdır.

2. İlham Əliyev "İnkişaf - məqsədimizdir". İyirminci kitab. Oktyabr 2006 - noyabr 2006. Bakı, "Azərnəşr", 2015, 408 s.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin oxuculara təqdim olunan "İnkişaf - məqsədimizdir" çoxcildliyinin bu cildində Azərbaycanın beynəlxalq aləmdə artan nüfuzuna, iqtisadi potensialın möhkəmlənməsinə, regionların sosial-iqtisadi inkişaf proqramının həyata keçirilməsi ilə əlaqədar Quba, Şəki, Lerik, Yardımlı, Gəncə, Daşkəsən, Gədəbəy, Şəmkir rayonlarına səfərləri, bu rayonların sosial, iqtisadi və mədəni cəhətdən inkişafına həsr olunmuş çıxışları, nitqləri və s. öz əksini tapmışdır.

3. İlham Əliyev "İnkişaf - məqsədimizdir". İyirmi birinci kitab. Noyabr 2006- dekabr 2006. Bakı, " Azərnəşr", 2015, 392 s.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin oxuculara təqdim olunan çoxcildlik əsərlərinin bu cildində regionların sosial inkişaf proqramının həyata keçirilməsi ilə əlaqədar Naxçıvan Muxtar Respublikasına və Xaçmaz rayonuna səfərləri, bir çox xarici ölkələrlə əlaqələrin və əməkdaşlığın daha da möhkəmlənməsinə aid zəngin materiallar dərc olunmuşdur.

4. "Dövlətçiliyin, milli maraqların və təhlükəsizliyin QARANTI" . Bakı, "Şərq-Qərb" Nəşriyyat Evi, 2015, 380 s.

" Dövlətçiliyin, milli maraqların və təhlükəsizliyin QARANTI" kitabı Azərbaycanın suverenliyinin, müstəqilliyinin və mənafelərinin qorunmasına, beynəlxalq aləmdə mövqelərinin möhkəmlənməsinə və nüfuzunun artmasına, milli tarixi yaddaşın və mənəvi irsin mühafizə edilərək gələcək nəsillərə çatdırılmasına, habelə mədəniyyətlər, sivilizasiyalar və konfessiyalar arasında yüksək əməkdaşlıq formatının təşəkkülünə, ümumən, respublikanın siyasi, iqtisadi və sosial həyatının bütün sahələrində güclü inkişafa nail olan, Ümummilli lider Heydər Əliyevin siyasi kursunu uğurla və inamla davam etdirən müdrik rəhbər, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin ölkəmizin təhlükəsizliyi, tərəqqisi və qüdrətlənməsi naminə məqsədyönlü və yorulmaz fəaliyyətindən bəhs edir.

5. Ziya Yusif - zadə "Böyük insan" . Bakı, "Azərnəşr", 2014, 288 s.

Kitaba ömrünün 50 ilini Azərbaycan təhlükəsizlik orqanlarında şərəfli xidmətə həsr etmiş, bu illərin çox hissəsini bilavasitə Ulu Öndərin rəhbərliyi altında işləmiş, Milli Təhlükəsizlik Nazirliyinin Heydər Əliyev adına Akademiyasinin rəisi vəzifəsində çalışmış general - leytenant Ziya Yusif-zadənin Heydər Əliyevi fenomen şəxsiyyət, dahi siyasətçi, əbədiyaşar lider - bütövlükdə BÖYÜK İNSAN kimi xarakterizə edən məqalə və müsahibələri toplanmışdır.

6. Muradov V. "Qazax - Borçalı bölgəsinin xalçaçıları". Bakı, 2014, 328 s.

Kitab - kataloq "Azərbaycan xalçaları bütün qrupları ilə" adlı böyük layihənin davamıdır. Qazax - Borçalı bölgəsinin tarixi inkişafı nəzərdən keçirilmiş, burada toxunan xalçaların ümumi xarakteristikası, həmçinin xalçaçıları haqqında məlumat və fotoşəkillər təqdim olunmuşdur.

7. Həsənov Ə. M. "Azərbaycanın geosiyasəti" . Dərslik. Bakı, "Zərdabi LTD" MMC, 2015, 1056 s.

Dərslikdə dünyanın əsas ölkələrinin Xəzər - Qara dəniz hövzəsi və Cənubi Qafqaz regionunda nümayiş etdirdikləri geosiyasi maraqlar və yürütdükləri siyasət fonunda Azərbaycan Respublikasının keçmiş, indiki və gələcək inkişaf məsələləri araşdırılır, milli inkişaf və təhlükəsizlik maraqlarının təmin edilməsi ilə bağlı dövlət siyasətinin əsasları şərh edilir.

8. Xəlil Rza Ulutürk. "Dramaturgiyada ədəbi əlaqələr". Bakı, "Elm"nəşriyyatı , 2014, 236 s.

Monoqrafiya görkəmli Azərbaycan dramaturqu İlyas Əfəndiyevin 100 illik yubileyi münasibətilə çapa hazırlanmış və yaradıcılığının rus klassikası ilə qarşılıqlı əlaqələri müasirlərinin dramaturji fəaliyyəti ilə birlikdə araşdırma obyekti olmuşdur.

9. Əli Tudə. "Bakının işıqları" . Bakı, "Azərbaycan" nəşriyyatı, 2014, 328 s.

Bu kitab şairin çapı nəzərdə tutulmuş 20 cildliyinin ikinci cildidir. Burda toplanan şeir və poemalar şairin doğma diyarından ayrıldığı, Vətənindən didərgin düşdüyü ilk illərə təsadüf edir və ayrılıq, həsrət, nisgil, Vətənə məhəbbət, sədaqət, vətəndaşlıq hissləri ilə zəngindir.

10. Hacıyeva M. "Ədəbi qaynaqlar". Bakı, "Elm və təhsil" , 2014, 242 s.

11. Muxtar Kazımoğlu (İmanov). "Folklor həm keçmiş, həm də bu gündür". Məqalələr. Bakı, "Elm və təhsil" , 2014, 194 s.

Kitaba müəllifin folklor, xalqlararası folklor əlaqələri, folklorşünaslığın müxtəlif problemləri ilə bağlı məqalələri və bir müsahibəsi daxil edilib

12. Lətifə Hüseynova. "Anam Xəzərim" . Bakı, 2015, 518 s.

Kitab Xəzər dənizi, onun tarixi, geoloji quruluşu, hidroloji rejimi, hidrometeoroloji xüsusiyyətləri, biomüxtəlifliyi, ekoloji durumundan, dənizin ətraf mühitinin mühafizəsi istiqamətində görülən işlərdən bəhs edir.

13. Aydın Mirzəzadə. "Müdriklik dərsləri". 1 hissə. Bakı, "Azərbaycan" nəşriyyatı, 2014, 160 s.

14. Hacı Şıxlinski. "Azərbaycanda filloksera ilə zədələnmiş müxtəlif üzüm sortlarının köklərində mikroorqanizmlərin tədqiqi və kompleksdavamlı formaların aşkar edilməsi" . Bakı, "Müəllim" , 2015, 368 s.

Monoqrafiyada üzüm tənəklərinin ən qorxulu zərərvericisi olan filloksеranın biologiyası, müasir sistematikası, yayılması və zərərvericiyə qarşı müxtəlif mübarizə metodları haqqında geniş məlumat verilir.

15. Səmyuel A. Uimz. " Ermənistan - terrorçu "xristian" ölkənin gizlinləri ". Ermənilərin böyük fırıldaq seriyaları". I cild. Təkrar nəşr. Bakı, "Mütərcim" , 2015, 388 s.

16.Buniyatov A. R. "Virtual təlim sistemləri texnologiyaları" . Bakı , ADPU - nun mətbəəsi , 2012, 130 s.

Müəllifin oxuculara təqdim etdiyi "Virtual Təlim Sistemləri texnologiyaları" dərsliyi, elektron təlim mühitində VTS -nin yaradılmasının və tətbiqinin texniki - texnoloji və didaktik - metodoloji aspektlərinin şərhini nəzərdə tutur.

17. Ziyadxan Nəbibəyli. "Gördüklərim - götürdüklərim". I cild. Bakı, "Adiloğlu" nəşriyyatı, 2015, 528 s.

Kitab əsasən müəllifin ilk dəfə təmasda olduğu Azərbaycanın böyük və dəyərli alimləri, ziyalıları, yazarları, tarixi şəxsiyyətləri ilə olan söhbətlərinə, onların həyatından bəzi məqamlara, Azərbaycanın milli - mənəvi dəyərlərinə, tariximizin ayrı - ayrı məqamlarına, eldən gələn kəlamlara həsr olunmuşdur.

18. Kəmalə Süleymanlı. "Müxtəlifsistemli dillərdə bağlayıcıların funksional - semantik xüsusiyyətləri" . (İngilis və Azərbaycan dillərinin materialları əsasında). Bakı, "Beynəlxalqkitab" , 2014, 192 s.

Dərs vəsaiti ingilis və Azərbaycan dillərində bağlayıcıların funksional - semantik təhlilinə həsr olunmuşdur.

19. Əmrahov M. "Stalinqradda tarixi qələbə" . Bakı, ADPU mətbəəsi, 2013, 114 s.

Kitabda Stalinqrad döyüşlərinin tarixşünaslığına nəzər salınmış, Volqa sahillərindəki döyüşlərdə, ümumilikdə İkinci Dünya müharibəsi illərində bəşəriyyətin faşizm əsarətindən azad olunmasında iştirak edən azərbaycanlılar haqqında məlumat verilmişdir.

20. Qaralov Zahid. "Heydər Əliyev - Milli ləyaqət ölçüsü" . Bakı, "Təhsil" , 2015, 408 s.

Professor Z. Qaralovun bu kitabı Azərbaycanı ağıllı siyasəti ilə tərəqqiyə aparan, dövlət idarəçiliyini şərəflə icra edib onun kəsilməz xətt boyunca inkişafının yollarını göstərən, hər bir azərbaycanlının Ulu öndər deyib fəxr etdiyi dahi bir şəxsiyyətin, ümummilli Liderimiz Heydər Əliyevin tarixi xidmətlərinə, elmi - siyasi irsinə həsr edilib.

21. Muradov V. "Azərbaycanın İrəvan bölgəsi: tarixi və xalçaları" . (XVIII əsrin II yarısı - XX əsrin əvvəlləri). Bakı, "MHS - Poliqraf" , 2015, 224 s.

Kitabda Azərbaycanın İrəvan bölgəsinin XVIII əsrin II yarısı - XX əsrin əvvəllərinə dair tarixi icmalı verilmiş, bölgənin mahallarında xalçaçılığın vəziyyəti nəzərdən keçirilmişdir.

22. " Qəbələ arxeoloji ekspedisiyasının hesabatları" . 2011 - 2012. İkinci nəşr. Bakı, "CBS" , 2014, 424 s.

23. Xasbulatov R. İ. "Beynəlxalq iqtisadi münasibətlər" . (Rus dilindən tərcümə). Bakı, "Zərdabi LTD" MMC, 2015, 808 s.

Bu kitabda beynəlxalq iqtisadi münasibətlərin müasir sisteminin əsas problemləri, onların formaları və təzahürləri nəzərdən keçirilir, nəzəriyyə və metodologiya məsələlərinə diqqət yetirilir.

24. Lomakin V. K. "Dünya iqtisadiyyatı" . Bakı, "Zərdabi LTD" , 2015, 736 s.

Dərslik dünya təsərrüfatının inkişafının və vəziyyətinin ən mühüm məsələlərinin məntiqi və tarixi baxımdan şərh olunması əsasında qurulmuşdur.

25. Əzizxan Tanrıverdi. "Azərbaycan dilinin tarixi qrammatikası" . III nəşr. Bakı, "Elm və təhsil" , 2014, 464 s.

Kitabda Azərbaycan dilinin inkişaf tarixi sistemli şəkildə izah olunmuş, tarixi fonetika və qrammatika, eləcə də leksikologiya məsələləri təkcə Azərbaycan yazılı abidələri yox, həm də Orxon - Yenisey abidələri, M.Kaşğarinin "Divanü - lüğat - it - türk" əsəri kimi qədim türk mənbələri müstəvisində nəzərdən keçirilmiş, oxşar və fərqli cəhətlər dəqiqləşdirilmişdir.

26. Əhmədov B. "XX əsr Azərbaycan ədəbiyyatı tarixi" . 3 cilddə. II cild. (Dərslik). Bakı, 2010, 436 s.

Dərslikdə Azərbaycan ədəbiyyatı tarixinin ən ziddiyyətli və mürəkkəb bir mərhələsinin (1920 - 1950- ci illər) hadisə, istiqamət və keyfiyyətləri yeni düşüncə orbitindən dəyərləndirilir.

27. Salamoğlu T. "Ədəbi tənqid tarixinə dair portret - oçerklər" . Dərs vəsaiti. (Yenidən işlənmiş III nəşr). Bakı, 2014, 332 s.

28. Təyyar Salamoğlu. "M. Ə. Sabirin milli intibah idealı" . Bakı, "Orxan" NPM, 2015, 144 s.

29. Təyyar Salamoğlu. "Azərbaycan ədəbiyyatının müasir problemləri" . (Elmi - nəzəri və ədəbi - tənqidi məqalələr). Bakı, "E. L." NPŞ MMC, 2014, 512 s.

Kitabda müəllifin ədəbiyyat tarixi, ədəbiyyatşünaslıq, ədəbi tənqid tarixi, çağdaş ədəbi proses, türk xalqları ədəbiyyatı və b. sahələr üzrə son illərdəki araşdırmaları yer almışdır.

30. Ələsgərov B. C. "Biblioqrafiya" . (Azərbaycanın elm və mədəniyyət xadimləri ). Bakı, "Nafta - Press", 2014, 105 s.

Biblioqrafiyada görkəmli coğrafiyaçı alim, coğrafiya elmlər doktoru, professor Bayram Cavad oğlu Ələsgərovun həyatının, elmi, elmi - təşkilati, pedaqoji və ictimai fəaliyyətinin əsas mərhələlərinin əks olunması nəzərdə tutulmuşdur.

31. Kazımov N. "Məktəb pedaqogikası" . Dərslik. (Ali pedaqoji məktəblərin bakalavryat pilləsi tələbələri, habelə dissertantlar, müəllimlər üçün. Yenidən işlənmiş və təkmilləşdirilmiş altıncı nəşri). Bakı, " Çıraq" , 2011, 440 s.

32. Nazim Müzəffərli (İmanov). "İqtisadiyyatın sosialyönlüyü sağçı və solçu sistemlərdə" . Bakı, "Şərq - Qərb" Nəşriyyat Evi, 2014, 272 s.

Kitab dövlətin sosial - iqtisadi proseslərdəki roluna münasibət əsasında fərqləndirilən sağçı və solçu siyasi - iqtisadi məfkurələrin təhlilinə həsr olunmuşdur.

33. Ruslan Ağasıyev (Ağasıyev Ruslan Elman oğlu). "Qələbəyə gedən yol". Naxçıvan, "Əcəmi" Nəşriyyat - Poliqrafiya Birliyi, 2015, 152 s.

34. Süleyman Məmmədov. "Azərbaycan tarixi" . (XV - XIX əsrin birinci otuzilliyi ). Dərslik. Bakı, "Çaşıoğlu" , 2004, 292 s.

Kitabda ilk qaynaqlar və mövcud ədəbiyyat əsasında Azərbaycanın feodal dövlətləri - Şirvanşahlar, Qaraqoyunlu, Ağqoyunlu və Səfəvilər dövlətlərinin sosial strukturu, siyasi həyatı, keşməkeşli və ziddiyyətli məqamları, dövlət quruluşu, ordu quruculuğu məsələləri işıqlandırılır, Ağqoyunlu və Səfəvilər dövlətlərinin Qərbi Avropa dövlətləri ilə diplomatik əlaqələrinin yaranması və inkişafı tarixi izlənilir.

35. Məmmədov V., Yusifov E. "Ekoloji menecment" . Dərs vəsaiti. 2 cilddə. I cild. Bakı, Nəşriyyat: "Meqa Basım" , 2014, 384 s.

Vəsait 2 cilddən ibarətdir. Birinci cilddə ekoloji təfəkkürün tarixi, biosenozlar, ekosistemlər, maddələrin dövranı, ekoloji amillər haqqında məlumat verilir.

36. Məmmədov V., Yusifov E. "Ekoloji menecment" . Ali məktəblər üçün dərs vəsaiti. 2 cilddə. II cild. Bakı, Nəşriyyat: "Meqa Basım" , 2014, 428 s.

Vəsaitin II cildində canlı aləm, qlobal ekoloji problemlər, ətraf mühit və insan sağlamlığı, təbiəti mühafizənin ekoloji prinsipləri, ətraf təbii mühitin keyfiyyətinin mühafizəsinin hüquqi əsasları, cəmiyyət - təbiət münasibətlərinin müasir strategiyası haqqında məlumatlar verilir.

37. Əsədov K. S., Mirzəyev O. H., Məmmədov F.M. "Dendrologiya" . Ali məktəblər üçün dərs vəsaiti. Bakı, "Gənclik" nəşriyyatı, 2014, 484+ 16 s.

Kitabda dendrologiyanın ümumi məsələləri, intraduksiya, iqlimləşdirmə, naturalizasiya, fitosenologiya , zonallıq, areal və onun tipləri haqqında anlayış verilir. Əsərdə 72 fəsilə, 185 cinsə daxil olan 715 növün arealı, morfologiyası, biologiyası, botaniki təsviri barədə məlumat verilmişdir.

38. Sabir Rüstəmxanlı. "Şair və şər". (düşüncələr romanı). Bakı, "Elm və təhsil" , 2015, 592 s.

Xalq şairi Sabir Rüstəmxanlı oxuculara təqdim etdiyi "Şair və şər" adlı düşüncələr romanını böyük millət şairi Məhəmməd Hadinin faciəli həyatına həsr etmişdir.

39. Sabir Rüstəmxanlı. "Əbədi sevda" . Şeirlər və poemalar. Bakı, "Təhsil" , 2012, 576 s.

Yeni kitabında bölünmüş və 35 milyonu hələ də İran rejiminin əlinin altında inləyən, ərazisinin iyirmi faizi Ermənistan tərəfindən işğal edilmiş Azərbaycan xalqının faciələri əsas mövzulardan biridir.

40. Bədirxan Əhmədov. "XX yüzil Azərbaycan ədəbiyyatı; mərhələlər, istiqamətlər, problemlər" . Bakı, "Elm və təhsil" , 2015, 552 s.

Monoqrafiyada Azərbaycan ədəbiyyatının milli hərəkat dövrü və onun realizm, romantizm, maarifçi realizm, Cümhuriyyət ədəbiyyatı, sosrealizm və 60-cı illər mərhələləri, ədəbi prosesin xarakteri, nəsr, poeziya, dramaturgiyanın inkişaf yolları, eləcə də repressiyanın genezisi, mühacirət və legion ədəbiyyatı və s. problemlər çağdaş meyarlarla araşdırma obyekti olur.

41. "Magistrlərin ümummilli lider Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş VIII elmi konfransının materialları" . Bakı, May 2015, 870 s.

42. Axundova G. Ə. "Azərbaycan bəstəkarlarının seçilmiş opera xorları" . Müntəxabat. Dərs vəsaiti. Bakı, ADPU-nun mətbəəsi , 2015, 254 s.

Dərs vəsaiti musiqi yönümlü ali və orta ixtisas məktəblərin, həmçinin Pedaqoji Universitetin musiqi şöbəsinin tələbələri üçün nəzərdə tutulmuşdur.

43. Mehrabov A. O. "Səriştəli müəllim hazırlığının problemləri". (monoqrafiya). Bakı, "Elm və təhsil", 2015, 288 s.

Monoqrafiyada pedaqoji təhsil və onun prioritetləri, səriştəli müəllim hazırlığı və onun reallaşdırılmasının əsas istiqamətləri , müəllim hazırlığında marketinq xidmətləri və təlim prosesinin təşkili məsələləri kimi problemlər üzrə tədqiqatlardan alınmış nəticələr ümumiləşdirilmiş və müvafiq təkliflər verilmişdir.

44. "Yonca bitkisinin müasir texnologiya ilə becərilməsinə dair" . Tövsiyələr. Bakı, "Elm və təhsil" , 2015, 24 s.

45. Əjdər Ağayev. "Təməldən əmələ". (ədəbi düşüncələr). Bakı, "Aspoliqraf", 2009, 328 s.

Kitabda müəllifin ədəbi düşüncələrinin məhsulu olan məqalələri toplanmışdır.

46. Ağayev Ə. Ə. "Seçilmiş pedaqoji əsərlər" . 2 cilddə. II cild. Bakı, "Mütərcim" , 2013, 214 s.

Ə. Ağayevin "Seçilmiş pedaqoji əsərlər" inin II cildi müəllifin pedaqogika tarixinə aid tədqiqatlarını əhatə edir.

47. Ağayev Ə. Ə. "Seçilmiş əsərləri". I cild. Bakı, "Mütərcim" , 2013, 400 s.

Birinci cilddə alimin pedaqogika tarixinə dair tədqiqat əsərləri yer tutur. Bu əsərlərdə müəllif müəyyən tarixi dövrdə fəaliyyət göstərmiş görkəmli təhsil xadimlərinin xidmətlərini, pedaqoji ideyalarını əks etdirir, eləcə də təhsilin inkişafında səmərəli rol oynamış məktəblərin tarixi təcrübəsini ümumiləşdirir.

48. Ağayev Ə. Ə. "Seçilmiş əsərləri" . II cild. Bakı, "Mütərcim" , 2013, 276 s.

Professor Ə. Ağayevin "Seçilmiş əsərləri"nin II cildinə müəllifin pedaqogika tarixinə dair bir kitabı, məqalələri və tezisləri daxil edilmişdir.

49. Ağayev Ə. Ə. "Seçilmiş əsərləri" . III cild. Bakı, "Mütərcim" , 2014, 472 s.

Bu cilddə Azərbaycan ictimai - pedaqoji fikrində şəxsiyyətin formalaşması ideyasının qaynaqları, şəxsiyyətin mahiyyəti və onun formalaşmasına təsir edən amillər haqqında fikirlər, şəxsiyyət tərbiyəsinin məzmunu, vəzifələri, vasitələri, prinsip və metodları geniş təhlil olunur, milli tərbiyənin elmi - pedaqoji əsasları şərh edilir, müasir şəraitdə şəxsiyyətin formalaşdırılması işində tarixi - nəzəri fikir və təcrübədən istifadə imkanları göstərilir.

50. Əjdər Ağayev "Seçilmiş əsərləri" . Uşaqlar üçün bədii əsərlər. VI cild. Bakı, "MM - S" müəssisəsi, 2015, 248 s.

Bu cilddə müəllifin uşaqlar üçün yazdığı şeirlər və hekayələr toplanmışdır.

51. Bəxtiyar Vahabzadə. Əsərləri . On iki cilddə. VII cild (2000 - 2004). Bakı, "Elm" nəşriyyatı, 2008, 463 s.

52. Bəxtiyar Vahabzadə. Əsərləri . On iki cilddə. VIII cild. (Son illərdə yazılmış, müvafiq cildlərə düşməyən və yenidən işlənən şeirlər). Bakı, "Elm" nəşriyyatı, 2009, 518 s.

53. Bəxtiyar Vahabzadə. Əsərləri . On iki cilddə. IX cild. (Mərsiyə - Rekviyem, hekayələr, pyeslər, teleradio pyeslər). Bakı, "Elm" nəşriyyatı, 2009, 828 s.

54. Ализаде А. «Л. Н. Толстой в Азербайджанском литературоведении (1880 - 1980)». Баку, "Elm və təhsil" , 2014, 132 s.

55. Кадиева С. «Проблемы перевода драматургии Н. Б. Везирова на русский язык». Баку, "Elm və təhsil" , 2014, 160 s.

56. Джафарли Г. «Русско - Турецкий математический словарь». Баку, MMXVI, 2014, 438 c.

**Fəridə Məmmədova,**
**Elmi kitabxananın məlumat-biblioqrafiya şöbəsinin böyük biblioqrafı**

# Əməkdar artist Şamil Süleymanov Dram dərnəyinin üzvləri ilə görüşüb

Oktyabrın ayının 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik zalında Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun dəstəyi ilə istedadlı və tanınmış aktyor, Əməkdar artist Şamil Süleymanovla universitetin Dram dərnəyinin üzvləri görüş keçiriblər. ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev görüşü giriş sözü ilə açaraq Şamil Süleymanovu tələbə-gənclərə təqdim edib, onun keçdiyi həyat və yaradıcılıq yolu barədə məlumat verib. Qeyd edək ki, görüşdə Dram dərnəyinin üzvləri ilə yanaşı, aktyorun pərəstişkarı olan digər tələbələr də iştirak ediblər. Görüş zamanı Dram dərnəyinin üzvləri Ş.Süleymanovun yaradıcılığını əks etdirən slayd nümayiş etdiriblər. Bundan əlavə, tədbirdə tələbələrin bədii qiraət nümunələri də dinlənilib. Tələbələrin suallarını cavablandıran aktyor Ş.Süleymanov Dram dərnəyinin üzvlərinə aktyorluq sənətindən ustad dərsləri keçəcəyini bildirib.

Sonda Bilik Fondu və Dram dərnəyinin üzvləri aktyora hədiyyələr təqdim edib, xatirə şəkli çəkdirilib.

**Mətbuat və İnformasiya şöbəsi**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının müdiri,professor İramin İsayevə qardaşı

**Vəzir İsayevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Biologiya fakültəsinin dekan müavini,dosent Nizam Mehdizadəyə qardaşı

**Mircəlilin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi texniki fənlər kafedrasının müdiri, dosent Akif İsmayılova anası

**Reyhan xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının dosenti

**Bilal Muradovun**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fəlsəfə və sosial fənlər kafedrasının baş müəllimi Taliyə Məmmədovaya oğlu

**Kamranın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 3537
Sayı: 1500
Çapa imzalanıb: 30.10.2015-ci il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.